QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Dekabr 2015
09 (1073)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Dünya azərbaycanlılarına

**Əziz həmvətənlər!**
**Hörmətli soydaşlar!**

Vətən təəssübkeşliyi, doğma yurda və milli-mənəvi dəyərlərə bağlılıq kimi nəcib hisslər aşılayan 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəylik Günü ərəfəsində sizi salamlayır, hər birinizə xoş arzu və diləklərimi çatdırıram.

Bütün soydaşlarımızın azərbaycançılıq ideologiyası ətrafında sıx birləşərək mütəşəkkil qüvvəyə çevrilməsi məsələsinə xüsusi diqqət yetirən ümummilli lider Heydər Əliyev bu sahədə tarixi qərarlar qəbul etmiş, xaricdə məskunlaşmış həmvətənlərimizin hüquqlarının qorunmasına, diaspor quruculuğunun geniş vüsət almasına yönələn əhəmiyyətli tədbirlər həyata keçirmişdir. Aparılan məqsədyönlü siyasətin nəticəsi olaraq, bu gün diaspor təşkilatlarımız fəaliyyət göstərdikləri ölkələrdə Azərbaycan həqiqətlərinin təbliği, milli maraqlarımızın müdafiəsi və respublikamızın digər dövlətlərlə qarşılıqlı faydalı münasibətlərinin dərinləşməsi işinə öz töhfələrini verirlər.

Hazırda davam edən qlobal maliyyə-iqtisadi böhrana baxmayaraq, hamımızın doğma vətəni olan Azərbaycan Respublikasında 2015-ci ildə də sosial-iqtisadi artım dinamikası qorunub saxlanmış, müxtəlif sahələri əhatə edən dövlət proqramları və infrastruktur layihələri ardıcıl icra edilmişdir. Ölkəmiz Avropa ilə Asiyanı, Şimalla Cənubu bir-birinə bağlayan nəhəng transmilli enerji-nəqliyyat layihələrinin həyata keçirilməsində mühüm rol oynayır. İlin əvvəlində təməli qoyulmuş TANAP layihəsi də daxil olmaqla, zəngin qaz ehtiyatlarımızın dünya bazarlarına nəqli sahəsində nəzərdə tutduğumuz planların gerçəkləşdirilməsi Azərbaycanın etibarlı enerji təchizatçısı kimi beynəlxalq aləmdəki rolunu daha da artıracaq, respublikamızın gələcək inkişafı və xalqımızın rifahının yüksəldilməsi yolunda yeni perspektivlər açacaqdır.

Bu il Azərbaycan böyük idman bayramına - Birinci Avropa Oyunlarına ev sahibliyi etmişdir. Qitənin 50 ölkəsinin idmançılarının iştirakı ilə keçirilən bu tədbir yüksək səviyyədə təşkil olunmuş, beynəlxalq ictimaiyyətdə dövlətimizin potensialı, xalqımızın çoxəsrlik tarixi və zəngin mədəniyyəti, qonaqpərvərliyi və tolerantlıq ənənələri barədə müsbət təəssüratlar yaratmışdır.

Son dövrlər dünyanın müxtəlif guşələrində hərbi-siyasi münaqişələrin və iğtişaşların artmasına baxmayaraq, Azərbaycanda mövcud olan ictimai-siyasi sabitlik, hakimiyyət və xalq arasında etimad mühiti daha da möhkəmlənmişdir. Noyabr ayında demokratik və şəffaf şəraitdə keçirilmiş növbəti parlament seçkiləri də cəmiyyətin nikbin əhval-ruhiyyəsinin, xalqımızın aparılan siyasətə dərin rəğbətinin parlaq təzahürü olmuşdur.

Təəssüflə qeyd etməliyəm ki, Ermənistanın təcavüzkar siyasəti və qeyri-konstruktiv mövqeyi ucbatından hələ də həllini tapmamış Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi hamımızı narahat edən taleyüklü problem kimi qalır. Bu gün Azərbaycan Respublikası güclü iqtisadiyyata və torpaqlarımızı hər an işğalçılardan azad etməyə hazır olan qüdrətli orduya malikdir. Lakin biz yenidən qan tökülməsinin qarşısını almaq, regionda gərginliyi artırmamaq məqsədilə münaqişənin beynəlxalq hüquq normaları çərçivəsində dinc yolla ədalətli həllinə çalışırıq. Hesab edirəm ki, bundan sonra da səylərimizi birləşdirməli, işğal edilmiş ərazilərimizin azad edilməsi uğrunda ardıcıl və məqsədyönlü iş aparmalıyıq. Bu sahədə diaspor təşkilatlarımızın da üzərinə mühüm vəzifələr düşür. Azərbaycanın suverenliyinin qorunması və ərazi bütövlüyünün təmin edilməsinə öz həmrəyliyimiz və birgə fəaliyyətimizlə sanballı töhfə vermək bizim başlıca amalımız olmalıdır.

Sizi Dünya Azərbaycanlılarının Həmrəylik Günü münasibəti ilə səmimi-qəlbdən təbrik edir, hər birinizə xoşbəxtlik, firavanlıq və işlərinizdə uğurlar arzulayıram.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 24 dekabr 2015-ci il*

## İmtahan sessiyasının təşkili və keçirilməsi barədə Azərbaycan Respublikası təhsil nazirinin ƏMRİ

Ali təhsil müəssisələrində 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyasını (bundan sonra imtahan sessiyası) mövcud qaydalara uyğun təşkil etmək, tələbələrin biliyinin qiymətləndirilməsində şəffaflığı və obyektivliyi təmin etmək məqsədilə

**ƏMR EDİRƏM:**

1. Ali təhsil müəssisələrinin rəhbərləri:

- imtahan sessiyasının mövcud normativ sənədlər əsasında təşkil olunmasını təmin etsinlər;
- rəhbərlik etdikləri ali təhsil müəssisələrində imtahan qərargahı yaratsınlar və qərargaha daxil olan hər bir şikayətin qısa müddətdə operativ şəkildə araşdırılmasını təmin etsinlər;
- imtahanların təşkilində və gedişində nöqsanlara, neqativ hallara yol vermiş şəxslər barədə mövcud qanunvericiliyə uyğun tədbirlər görsünlər;
- nəzərə alsınlar ki, rəhbərlik etdikləri ali təhsil müəssisəsində baş verə biləcək hər bir neqativ hala görə məsuliyyət daşıyırlar;
- imtahan sessiyasında şəffaflığı təmin etmək üçün imtahanlarda ictimaiyyətin və valideynlərin iştirakına şərait yaratsınlar;
- imtahan sessiyasının təşkili, keçirilməsi və nəticələri barədə sessiya bitdikdən sonra 10 gün müddətinə Təhsil Nazirliyinə yekun hesabat versinlər;
- Təhsil Nazirliyi tərəfindən imtahan sessiyasının monitorinqinin aparılması üçün lazımı şəraitin (otağın ayrılması, telefonla təchiz edilməsi) yaradılmasını təmin etsinlər.

2. Elm və ali təhsil və Daxili nəzarət şöbələrinə tapşırılsın:

- ali təhsil müəssisələrində imtahan sessiyasının monitorinqini təşkil etsinlər;
- imtahan sessiyasına hazırlıq dövründə və sessiya müddətində ali təhsil müəssisələrində baş vermiş neqativ hallarla bağlı daxil olan məlumatları operativ araşdıraraq onların yerində həll edilməsini təmin etsinlər. Bu hallara yol vermiş şəxslər müəyyənləşdirilərək onlar barəsində tədbirlərin görülməsi və nəticəsi barədə Nazirliyi məlumatlandırsınlar;
- ali təhsil müəssisələrində payız semestrinin imtahan sessiyalarının nəticələrini təhlil edib müvafiq arayışları müzakirəyə təqdim etsinlər.

3. Təhsil Nazirliyinin QHT və KİV-lə iş sektorunun müdiri (C.Valehov) Nazirliyin «Qaynar xətt» xidmətinin fəaliyyəti və imtahan sessiyasının gedişi barədə kütləvi informasiya vasitələrinə müntəzəm olaraq məlumat verilməsini təmin etsin.

4. Əmr «Azərbaycan müəllimi» qəzetində dərc edilsin və nazirliyin internet saytında yerləşdirilsin.

5. Əmrin icrasına nəzarəti öz üzərimə götürürəm.

ƏSAS: Elm və ali təhsil şöbəsinin 2015-ci il üçün iş planı.

**Mikayıl CABBAROV,**
**Azərbaycan Respublikasının təhsil naziri**
*15 dekabr 2015-ci il*

## Dahi şəxsiyyət, dünya şöhrətli dövlət xadimi

### *ADPU-da ümummilli lider Heydər Əliyevin anım mərasimi keçirilib*

Dekabr ayının 11-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında xalqımızın ümummilli lideri Heydər Əliyevin anım mərasimi keçirilib. Əvvəlcə universitetin rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi Fəxri Xiyabanda ulu öndər Heydər Əliyevin məzarını ziyarət edib, məzarı Ulu Öndərə öz mənəvi borcunu vermək üçün Fəxri Xiyabana üz tutmuşdu, dahi liderimizə olan ümumxalq sevgisi, ümumxalq məhəbbəti özünü hər yerdə göstərirdi.

Ulu öndərimiz Heydər Əliyevin vəfatı eyni zamanda bütün dünyada böyük əks-səda doğurmuşdu. Dünyanın böyük mövcudluğunun, fəaliyyətinin, bütövlükdə həyatının ideya-konseptual prinsiplərinin təməli qoyuldu. İqtisadi və mənəvi tənəzzül dövrünü yaşayan Azərbaycanın tərəqqiyə, cəmiyyətin keyfiyyətcə irəliyə, milli özünüdərkə, milli özünəqayıdışa dönüşünün başlanğıcı oldu. Heydər Əliyevin





önünə əklil və gül dəstələri qoyub. Xalqımızın görkəmli oftalmoloq alimi, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri qoyulub. Sonra universitetin Böyük Akt zalında Ulu Öndərin anım mərasimi keçirilib. Anım mərasimində ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib və ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov anım mərasimində çıxış edərək bildirib ki, xalqımızın böyük oğlu, Türk dünyasının məşhur siyasət və dövlət xadimi, ulu öndərimiz Heydər Əliyevin vəfatından 12 il keçir. 2003-cü il dekabr ayının 12-si sözün həqiqi mənasında xalqımız, millətimiz üçün çox ağır və kədərli bir gündür. Çünki xalqımız həmin gün öz böyük oğlunu, millətsevər rəhbərini itirmişdi. Qədirbilən xalqımız böyük kədər və sıxıntı içində öz müdrik, vətənpərvər rəhbəri ilə vidalaşırdı. Hamı bir nəfər kimi və aparıcı dövlətlərinin rəhbərləri, ən məşhur şəxsləri, tanınmış siyasətçiləri Heydər Əliyevlə vidalaşmaq və cənazə törəninə qatılmaq üçün Bakıya gəlmişdilər. Ümummilli Liderimizin vəfatı ilə əlaqədar Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevə ünvanlanan məktub və teleqramların sayı-hesabı yox idi.

Rektor Yusif Məmmədov qeyd edib ki, ulu öndərimiz Heydər Əliyev son 35-40 ildə dövlətimizin hərtərəfli inkişafında və dünya miqyasında tanınmasında əvəzsiz xidmətlər göstərmiş böyük tarixi şəxsiyyətdir. Biz bu gün həyatımızın hansı sahəsinə diqqət yetirsək, xalqımızın bu böyük oğlunun fədakar əməyini, çoxcəhətli fəaliyyətini görürük. Dahi şəxsiyyət Heydər Əliyev hələ Sovetlər Birliyi dövründə Azərbaycana rəhbər seçilərkən ölkəmizi tənəzzüldən xilas etmiş, onu inkişaf yoluna çıxarmışdır. Belə ki, Heydər Əliyevin 1969-cu ilin iyul ayının 14-də Azərbaycana rəhbər seçilməsi ilə Azərbaycan cəmiyyətinin hakimiyyətə gəlişi ilə qısa müddətdə cəmiyyət həyatının bütün sahələrinin sürətli yüksəlişi, istehsalın, elmin, mədəniyyətin, mənəviyyatın tərəqqisi əslində daha böyük nailiyyətlərə, milli ruhun inkişafına, milli özünüdərkin və milli qürurun yüksəlməsinə səbəb oldu. Bunlar isə gələcəkdə müstəqil Azərbaycan dövlətinin yaranmasına xidmət edən əzəmətli planın tərkib hissəsini təşkil etdi.

Müasir müstəqil Azərbaycan dövlətinin bünövrəsi məhz Heydər Əliyevin respublikaya rəhbərliyinin ilk mərhələsində (1969-1982) qoyulmuş, həmin dövrdə ölkə iqtisadiyyatının sürətli inkişafı, milli-mənəvi dəyərlərimizə yüksək həssaslıqla yanaşma, məqsədyönlü kadr hazırlığı bugünkü müstəqil Azərbaycam uzaqgörənliklə öz hədəfinə almışdır. Ümummilli lider Heydər Əliyev XX əsrin sonu və XXI əsrin əvvəllərində

(Davamı 2-ci səhifədə)

# Dahi şəxsiyyət, dünya şöhrətli dövlət xadimi

(Əvvəli 1-ci səhifədə)




böyük siyasi məharətlə Azərbaycanı, dövlətçiliyimizi, müstəqilliyimizi hədələyən bütün bəlaları dəf etmiş, iqtisadiyyatımızın, beynəlxalq əlaqələrimizin, milli birliyimizin möhkəm özülünü quraraq bizlərə əmanət etmişdir.

Ulu öndər Heydər Əliyev həmişə elmə, təhsilə böyük qayğı və diqqət göstərmişdir. Müxtəlif ali təhsil müəssisələrinin yaranması, xalqın ali təhsilə cəlb olunması, elmi-tədqiqat institutlarının yaradılması, tədqiqat işlərinin genişlənməsi və AMEA-nın gərgin axtarışlarla zəngin fəaliyyəti məhz bu illərə təsadüf edir. Azərbaycanda təhsil sisteminin, o cümlədən ali təhsil müəssisələrinin formalaşmasında, dövrün tələblərinə uyğun yenidən qurulmasında, sürətlə inkişafında, milli kadrların hərtərəfli hazırlanmasında bu böyük şəxsiyyətin əvəzsiz xidmətləri vardır. Heydər Əliyevin daimi diqqət və qayğısı sayəsində respublikamızda məktəbəqədər tərbiyə müəssisələrindən tutmuş, ali məktəblərə qədər bütün təhsil müəssisələrinin şəbəkəsi ilbəil genişləndi, təhsil sisteminin maddi-texniki bazası ardıcıl surətdə möhkəmləndirildi. Ulu Öndər respublikamızda ali pedaqoji təhsilin öncülü sayılan Azərbaycan Dövlət Pedaqoji Universitetinin tədris və elmi həyatı ilə daim maraqlannış, Pedaqoji Universitetin yenidən qurulması, genişlənib möhkəmlənməsi üçün ciddi tədbirlər həyata keçirmişdir. Bu qayğı və diqqəti müasir dövrümüzdə Azərbaycan Prezidenti cənab İlham Əliyev davam etdirir.




Heydər Əliyevin Azərbaycana uzunmüddətli rəhbərliyinin ən sanballı göstəricilərindən biri də respublikada Azərbaycançılıq məfkurəsinin və milli ruhun hədsiz yüksəlişi, milli özünüdərkin keçmişin bütün buxovlarından azad olması, xalqın tarixi yaddaşının özünə qaytarılması kimi fundamental prinsiplər əsasında milli dövlətçilik arzularının və hisslərinin güclənməsi, real siyasi amilə çevrilməsidir. Həmişə «Hər bir insan üçün onun milli mənsubiyyəti onun qürur mənbəyidir. Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam!» deyən Heydər Əliyev ən böyük Azərbaycanlı idi.

Bu gün müstəqil Azərbaycan dünya miqyasında böyük uğurlar, nailliyyətlər qazanır. Azərbaycanda mötəbər beynəlxalq humanitar forumlar keçirilir. Bu humanitar forumlarda dünyanın tanınmış və məşhur siyasətçiləri, dövlət rəhbərləri, elm xadimləri, Nobel mükafatçıları iştirak edirlər. Ölkəmiz bu ilin iyun ayında bəşəriyyət tarixində ilk dəfə keçirilən I Avropa Oyunlarına ev sahibliyi etdi. Təşkilat Komitəsinin sədri Mehriban xanım Əliyevanın yüksək təşkilatçılıq və idarəçilik qabiliyyəti, həmçinin ölkəmizdə idman sahəsində həyata keçirilən uğurlu siyasət və eyni zamanda bu sahədə qazanılmış böyük təcrübə Azərbaycanın bu möhtəşəm beynəlxalq tədbiri də müasir dünya standartlarına uyğun keçirməsini təmin etdi. Cənab Prezidentin qeyd etdiyi kimi, Azərbaycan yaxın gələcəkdə inkişaf etmiş ölkələrin sırasına daxil olmağı qarşısına məqsəd qoyub.

Rektor Y.Məmmədov çıxışının sonunda bildirib ki, qədirbilən xalqımız həmişə ulu öndər Heydər Əliyevin xatirəsini əziz tutacaq, onun dövlətçilik ideallarını yüksək qiymətləndirəcəkdir.

Anım mərasimində Türk Xalqlarının Ümumdünya Konqresinin prezidenti Hacı Yəhya Caniyar və qazaxıstanlı akademik, iqtisadçı, yazıçı-publisist, Qazaxıstan Jurnalistlər İttifaqının üzvü Baxit Xoca Rüstəmov çıxış edərək Heydər Əliyevlə bağlı xatirələrini bölüşüb, Ulu Öndəri bütün Türk dünyasının məşhur siyasi xadimi, görkəmli dövlət rəhbəri kimi səciyyələndiriblər.

Anım mərasimində müdrik şəxsiyyət Heydər Əliyevin həyatından bəhs edən kinosujetlər göstərilib. Filologiya fakültəsinin III kurs tələbəsi Nərmin Səlimova Xalq şairi Zəlimxan Yaqubun "Prezident ömrünün son saatları" şeirini söyləyib. ADPU-nun birləşmiş xoru musiqisi Nailə Mirməmmədliyə, sözləri Nərmin Kamilovaya aid olan "Ürəklərdə yaşasın", həmçinin "Xalq Heydər deyəcək" mahnılarını ifa edib. Kimya fakültəsinin II kurs tələbəsi Gülbəniz Mehdiyeva "Vətən oğlu" və "Heydər ata" şeirlərini, Filologiya fakültəsinin III kurs tələbəsi Nərmin Əliyeva Xalq şairi Zəlimxan Yaqubun "Minnətdarlıq", həmin fakültənin I kurs tələbəsi Rəhimə Mürvətova "Ən böyük abidənin ölməz adı sevgidir", II kurs tələbəsi Cəmilə Məhərrəmova isə "Sənin yerin görünəcək" şeirlərini söyləyiblər. Tədbirin sonunda ADPU-nun birləşmiş xoru və solist Fəxri Hüseynov Müslüm Maqomayevin "Azərbaycan" mahnısını ifa ediblər.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**



# Rəşadətli general

## ADPU-da general Səməd bəy Mehmandarovun 160 illik yubileyinə həsr olunmuş elmi konfrans keçirilib

Dekabr ayının 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası"nda general Səməd bəy Mehmandarovun 160 illik yubileyinə həsr olunmuş elmi konfrans keçirilib. Konfransda öncə Səməd bəy Mehmandarovun xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov konfransı giriş sözü ilə açaraq bildirib ki, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bu il sentyabr ayının 29-da "General Səməd bəy Mehmandarovun 160 illik yubileyinin keçirilməsi haqqında" Sərəncam imzalamışdır. Həmin Sərəncamda qeyd edilir ki, 2015-ci ildə görkəmli hərbi xadim, Azərbaycan Xalq Cümhuriyyətinin hərbi naziri, general Səməd bəy Sadiq bəy oğlu Mehmandarovun anadan olmasının 160 illiyi tamam olur.

General Səməd bəy Mehmandarov döyüş meydanlarındakı yüksək peşəkarlığı və zabit şərəfinə hədsiz sədaqəti ilə Azərbaycan xalqının hərb salnaməsinə unudulmaz səhifələr yazmışdır. Azərbaycan Xalq Cümhuriyyəti yaradılarkən ordu quruculuğu prosesinin bütünlüklə milli zəmin üzərində həyata keçirilməsi, hərbi potensialın məharətlə istiqamətləndirilməsi və konkret tarixi şəraitdə ölkənin ərazi bütövlüyünün, hərbi təhlükəsizliyinin layiqincə təşkil edilməsi məhz onun fəaliyyətinin nəticələridir. Sərəncamda gənc nəslin azərbaycançılıq məfkurəsinə uyğun, Vətənə məhəbbət ruhunda tərbiyəsində əhəmiyyətini nəzərə alaraq, Azərbaycan xalqı qarşısında müstəsna xidmətlər göstərmiş general Səməd bəy Mehmandarovun 160 illik yubileyinin dövlət səviyyəsində keçirilməsini təmin etmək məqsədi ilə Müdafiə Nazirliyinin Təhsil Nazirliyi və Mədəniyyət və Turizm Nazirliyi ilə birlikdə görkəmli hərbi xadim, general Səməd bəy Mehmandarovun 160 illik yubileyinə dair tədbirlər planını hazırlayıb həyata keçirmələri və Nazirlər Kabinetinin bu Sərəncamdan irəli gələn məsələləri həll etməsi öz əksini tapmışdır. Bizim bu gün keçirdiyimiz elmi konfrans da yuxarıda qeyd etdiyim Sərəncama uyğun olaraq keçirilən bir tədbirdir. Qeyd etmək istəyirəm ki, görkəmli general Səməd bəy Mehmandarovun 160 illik yubileyinin dövlət səviyyəsində keçirilməsi şanlı hərb tariximizin öyrənilməsi, gənc nəslin hərbi-vətənpərvərlik ruhunda tərbiyə olunması və müasir ordu quruculuğunun inkişaf etdirilməsi baxımından mühüm əhəmiyyət kəsb edir.




Rektor Y.Məmmədov giriş nitqində öz adını xalqımızın hərb tarixinə şərəflə yazmış general Səməd bəy Mehmandarovun həyatı və hərbi fəaliyyəti ilə bağlı məlumatları elmi konfrans iştirakçılarının diqqətinizə çatdırıb. Rektor bildirib ki, Səməd bəy Mehmandarov 1855-ci il oktyabrı ayının 16-da Lənkəranda anadan olmuşdur. Bakıda gimnaziya təhsili almış, 16 yaşında Sankt-Peterburqda yerləşən II Konstantinovka Artilleriya Məktəbinə daxil olmuşdur. 1875-ci ilin dekabr ayında podporuçik rütbəsi almış və üçüncü dərəcəli "Müqəddəs Stanislav" ordeni ilə təltif edilmişdir. 1890-cı ildə kapitan, 1898-ci ildə podpolkovnik, 1901-ci ildə polkovnik, 1904-cü ildə general-mayor rütbəsi almışdır. 1904-1905-ci illərin Rus-Yapon müharibəsində böyük rəşadət göstərmiş S.Mehmandarova 1908-ci ildə tam artilleriya generalı rütbəsi verilmişdir. Qeyd edək ki, general S.Mehmandarov xalqımızın digər bir məşhur generalı, "Artilleriya Allahı" adını almış Əliağa Şıxlinski ilə birlikdə Port-Artur qalasının müdafiəsində böyük hərbi istedad və igidlik nümayiş etdirmişlər.

Birinci Dünya müharbəsi başlayarkən Varşava ətrafında xidmət edən general S.Mehmandarovun komandir olduğu 21-ci piyada diviziyasının tərkibində 4 alay var idi: 81-ci Abşeron alayı, 82-ci Dağıstan alayı, 83-cü Samur alayı və 84-cü Şirvan alayı. Diviziya komandiri S.Mehmandarov Lodz istiqamətində aparılmış döyüşdə alman generalı Makenzonun ordusu üzərində qələbə qazanmışdır.



1915-ci ildə general S.Mehmandarov korpus komandiri təyin edilmişdir. O, 1917-ci ilin əvvəllərində Rusiyanın bütün hərbi ordenləri ilə, eləcə də İngiltərənin, Fransanın, Rumıniyanın bir neçə hərbi ordenləri ilə təltif edilmişdir. Rusiyada 1917-ci ilin Fevral inqilabı baş verərkən S.Mehmandarov Qafqazda idi. Həmin ilin aprel ayında o, istefaya çıxmış, bir müddət Vladiqafqaz şəhərində yaşamış, sonra isə Azərbaycana gəlmişdir. General S.Mehmandarov Azərbaycan Xalq Cümhuriyyəti hökümətində 1918-ci ilin dekabr ayının 25-dən Hərbi nazir vəzifəsini tutmuş və qısa müddət ərzində müstəqil Azərbaycanın 30 minlik ordusunu yaratmağa nail olmuşdu. O, hərbi səfərbərlik, hərbi xidmətə çağırış, orduda danışıq və dəftərxana dilinin Azərbaycan dili olması, ordunun milli hərbi kadrlarla, hərbi texnika, hərbi geyim və ərzaqla təmin edilməsi, hərbi-sənaye kompleksinin yaradılması istiqamətlərində uğurlu və qətiyyətli addımlar atmışdır.

Məlum olduğu kimi, 1919-cu ilin yazında ingilis hərbi hissələri Azərbaycanda idi. Hərbi nazir S.Mehmandarov Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin başçısı Nəsib bəy Yusifbəyliyə göndərdiyi rəsmi məktubda bildirmişdir ki, ingilis hərbi dəstələri Azərbaycanda olduqları yerlərdə talanlar edir, kəşfiyyat işi aparırlar. Bunlara etiraz olaraq S.Mehmandarov İngiltərə hökumətinin Birinci Dünya müharibəsi illərində ona verdiyi ordenləri İngiltərə hökumətinə qaytarmağı Azərbaycan hökumətindən xahiş etmişdir.

Azərbaycanda 1920-ci il aprel ayının 28-də Sovet hakimiyyəti qurulduqdan sonra general S.Mehmandarov xalqımızın böyük oğlu, görkəmli ictimai-siyasi xadim, tanınmış yazıçı Nəriman Nərimanovun şəxsi zəmanəti əsasında hərbi fəaliyyətini davam etdirmiş, ölkəmizdə yaradılmış hərbi komandirlər məktəbində 1921-ci illərdə müəllimlik edərək topçuluq ixtisasından dərs demişdir. Qafqaz Ordusunun komandiri olmuş birinci dərəcəli ordu komandiri İ.Ç.Yakir 1925-ci ildə onun haqqında belə yazmışdır: "Mehmandarov nadir artilleriyaçıdır".

General Səməd bəy Mehmandarov 1924-1927-ci illərdə Azərbaycanda hərbi sahədə aparılan geniş islahatlarda və tədbirlərdə fəal iştirak etmişdir. O, 1928 -ci ildə səhhətinə görə ordudan təxris olunmuş və ona fərdi dövlət təqaüdü verilməsi müəyyən edilmişdir. General-polkovnik S.Mehmandarov öz dövrünün görkəmli şəxsiyyətlərindən biri olmuşdur. O, türk və fars dillərini yüksək səviyyədə bilmiş, ömrünün son üç ilində İslam tarixi və fəlsəfə ilə məşğul olmuşdur.

Xalqımızın vətənpərvər oğlu, böyük hərbi xadim, general Səməd bəy Mehmandarov 1931-ci il fevral ayının 12-də Bakıda vəfat etmişdir. Qədirbilən xalqımız Azərbaycan Xalq Cümhuriyyəti liderlərinin, o cümlədən Səməd bəy Mehmandarovun xatirəsini əziz tutur. General Səməd bəy Mehmandarovun müxtəlif tarixi mərhələlərdə fəaliyyət göstərən, öz milli mənliyi və bütöv xarakteri ilə seçilən rəşadətli general kimi xalqımızın yaddaşında əbədi yaşayacaqdır.

Qeyd edək ki, elmi konfransda ADPU-nun Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mais Əmrahov "General Səməd bəy Mehmandarov və gənclərin hərbi-vətənpərvərlik tərbiyəsi" mövzusunda, yazıçı-jurnalist, polkovnik-leytenant Şəmistan Nəzərli "General Səməd bəy Mehmandarov-Azərbaycan Xalq Cümhurriyyətinin ilk ordu qurucusu", Fəlsəfə və sosial fənlər kafedrasının dosenti, Əməkdar jurnalist Yasin Qaraməmmədli "General Səməd bəy Mehmandarov və müasir gənclik" mövzusunda məruzələrlə çıxış ediblər. Məruzəçi və çıxış edənlər Səməd bəy Mehmandarovu böyük hərbi dühaya malik sərkərdə, Azərbaycan Xalq Cümhurriyyətinin ordu quruculuğunda müstəsna xidmətlər göstərmiş rəşadətli general kimi səciyyələndiriblər.

Konfrans suallar və çıxışlarla yekunlaşıb.

**Gülnar SLEYMANOVA**

# ADPU-da Xalq şairi Nəriman Həsənzadə ilə görüş keçirilib

Dekabr ayının 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) istedadlı və görkəmli söz ustadı, tanınmış ziyalı, Xalq şairi, dramaturq, filologiya üzrə fəlsəfə doktoru, professor, Əməkdar




incəsənət xadimi Nəriman Həsənzadə ilə görüş keçirilib. Görüşdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi, həmçinin tanınmış ziyalılar, yazıçı və şairlər, elm və təhsil xadimləri iştirak ediblər.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov görüşü giriş sözü ilə açaraq bildirib ki, Xalq şairi Nəriman Həsənzadə ilə keçirilən bu görüş Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının və İctimai Televiziya və Radio Yayımları Şirkətinin birgə layihəsi olan “Gənclik həyatı” layihəsi əsasında keçirilir. Rektor Y.Məmmədov çıxışı zamanı deyib ki, bu, bizim sevimli şairimiz Nəriman Həsənzadə ilə Pedaqoji Universitetdə keçirdiyimiz sayca ikinci görüşdür. Xüsusi vurğulamaq istəyirəm ki, xalqımızın Nəriman Həsənzadə kimi tanınmış yazıçıları, şairləri, ziyalıları ilə belə görüşlərin keçirilməsi tələbə-gənclərimizin intellekt səviyyəsinin yüksəlməsində, dünyagörüşünün genişlənməsində, bədii ədəbiyyata marağının artmasında, daxili mənəvi dünyasının zənginləşməsində mühüm rol oynayır.

Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, Xalq şairi Nəriman Həsənzadə sözün həqiqi mənasında böyük zəhmət və çətinliklərlə dolu, lakin mənalı və şərəfli bir ömür yolu keçib. Buna o öz dərin biliyi, yüksək istedadı, çalışqanlığı, əməksevərliyi, fədakarlığı və möhkəm iradəsi hesabına nail olub.

Rektor Y.Məmmədov çıxışında böyük şairimiz Nəriman Həsənzadənin keçdiyi həyat yolu və ədəbi fəaliyyəti ilə bağlı məlumat verərək bildirib ki, Nəriman Əliməmməd oğlu Həsənzadə 1931 -ci il fevral ayının 18-də Qazax (indiki Ağstafa) rayonunun Poylu qəsəbəsində anadan olub. Bir yaşında atasını, iyirmi üç yaşında isə anasını itirib. İbtidai və orta təhsilini öz doğma rayonlarında alıb. 1949-1953-cü illərdə indiki Gəncə Dövlət Universitetinin Filologiya fakültəsində ali təhsil alıb. 1954-1956-cı illərdə keçmiş Sovet Ordusu sıralarında hərbi xidmətdə olub. Azərbaycan Yazıçılar İttifaqının göndərişi əsasında Moskvadakı İkiillik Ədəbiyyat Kursunu bitirdikdən sonra Qorki adına Ədəbiyyat İnstitutuna daxil olub və beş il bu institutda təhsil alıb. 1962-1965-ci illərdə Azərbaycan Dövlət Universitetinin (indiki BDU) Azərbaycan ədəbiyyatı tarixi kafedrasının aspirantı olub. Bədii yaradıcılıqla yanaşı, elmi fəaliyyətlə də məşğul olmuş, 1965-ci ildə ”Azərbaycan-Ukrayna ədəbi əlaqələri” mövzusunda dissertasiya müdafiə edərək filologiya elmləri namizədi (indi fəlsəfə doktoru) alimlik dərəcəsi alıb. 1962-ci ildə Televiziya və Radio Verilişləri Komitəsində (indi “Azərbaycan Televiziya və Radio Verilişləri”Qapalı Səhimdar Cəmiyyəti) böyük redaktor, sonralar ”Uşaq və gənclər ədəbiyyatı nəşriyyatı”nda redaktor, ”Azərbaycan gəncləri” qəzetində, ”Azərbaycan” jurnalında şöbə müdiri, 1976-1990-cı illərdə isə ”Ədəbiyyat və incəsənət” qəzetinin baş redaktoru vəzifələrində işləyib. Azərbaycanın və Belarusun fəxri fərmanları ilə təltif olunub. SSRİ yazıçılarının Ədəbiyyat Fondunun Azərbaycan bölməsinin direktoru olub.



N.Həsənzadə bir sıra Avropa və Şərq ölkələrində keçirilən elmi-ədəbi konfransların, poeziya simpoziumlarının, rəsmi dövlət səfərlərinin iştirakçısı olub. 1991-2001-ci illərdə Mətbuat və informasiya nazirinin birinci müavini vəzifəsində çalışıb, bir müddət Mətbuat və informasiya nazirini əvəz edib. 1992-ci ildə Türkiyə Respublikasının Böyük Millət Məclisində xalq deputatı kimi nümayəndə heyəti adından çıxış edib.

2002-ci ildə Beynəlxalq Elmlər Akademiyasının Azərbaycan bölməsinin müxbir üzvü, 2004-cü ildə isə akademik seçilib. 2004-cü ildə Azərbaycan yazıçılarının XI qurultayında katibliyin qərarı ilə Ədəbiyyat Fondu İdarə Heyətinin sədri təyin edilib.

Rektor Y.Məmmədov qeyd edib ki, N.Həsənzadənin ədəbi-bədii və ictimai-siyasi fəaliyyəti ölkə rəhbərliyi tərəfindən yüksək qiymətləndirilib. O, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin müvafiq Sərəncamı ilə 2005-ci ildə “Xalq şairi” fəxri adına layiq görülüb. 2011-ci ildə ”Şərəf” ordeni ilə təltif edilib və Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünə layiq görülüb. Hazırda Azərbaycan Milli Aviasiya Akademiyasının Humanitar fənlər kafedrasının müdiri vəzifəsində işləyir, dosentdir. Milli Aviasiya Akademiyası Elmi Şurasının üzvüdür.

Xalq şairi N.Həsənzadənin yüksək bədii səviyyəyə malik əsərləri xarici mətbuat səhifələrində, o cümlədən “Vətənsiz” poeması 2009-cu ildə Rumıniyada, “Nuru Paşa” poeması isə Türkiyədə dərc edilib. 2009-cu ildə Türkiyədə keçirilən “Kayseri poeziya günləri”ndə şair yüksək mükafatlara layiq görülüb. Həmin il N.Həsənzadə “İlin şairi” elan olunub və



ona “Uğur - 2009” diplomu verilib.

Xalq şairi N.Həsənzadə ADPU-da onunla görüşün keçirilməsinə görə universitetin rəhbərliyinə, eləcə də Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqına və İctimai Televiziya və Radio Yayımları Şirkətinə öz təşəkkürünü bildirib. N.Həsənzadə ADPU-nun rektoru, professor Yusif Məmmədovun böyük alim, görkəmli ziyalı, bacarıqlı elm və təhsil təşkilatçısı, ləyaqətli vətəndaş olduğunu vurğulayıb, ona elmi-pedaqoji fəaliyyətində uğurlar arzulayıb. Sonra N.Həsənzadə tələbə-gənclərə keçdiyi həyat yolundan, bədii yaradıcılığından danışıb, onların müxtəlif suallarını cavablandırıb, öz şeirlərini söyləyib.

ADPU-nun Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov çıxış edərək Xalq şairi N.Həsənzadəni görkəmli şair, əsl ziyalı, təcrübəli pedaqoq-alim kimi səciyyələndirib, onun keşməkeşli və mənalı həyat yolunun gənclik üçün layiqli örnək olduğunu vurğulayıb.

**Mətbuat və informasiya şöbəsi**

# Elmi Şuranın iclası keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının dekabr ayının 29-da keçirilən iclasının gündəliyinə aşağıdakı məsələlər daxil idi: “İlin alimi” müsabiqəsinin yekunları; “İlin müəllimi” müsabiqəsinin yekunları; 2015-2016-cı il tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlıq haqqında; Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin hesabatı; ”Dədə Qorqud” elmi-tədqiqat laboratoriyasının hesabatı; cari məsələlər.

Elmi Şuranın iclasını ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov açaraq bildirib ki, Təhsil naziri cənab Mikayıl Cabbarovun 25 noyabr 2015-ci il tarixli 11/1180 nömrəli əmri ilə yüksəkixtisaslı kadrların hazırlanması sahəsində uzun müddət səmərəli fəaliyyət göstərdiklərinə görə ADPU-nun 4 nəfər əməkdaşı təltif edilib. Təltif edilən əməkdaşlar aşağıdakı şəxslərdir:

1. **Abdullayev Nadir Əziz oğlu** - Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının professoru - “Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi” döş nişanı ilə;
2. **Məmmədova Rəna Feyzullayevna** - Elektrik və optika kafedrasının dosenti - “Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi” döş nişanı ilə;
3. **Rəştiyev Fikrət Mövsüm oğlu** - Fizikanın tədrisi metodikası kafedrasının dosenti - “Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri Fərmanı” ilə;
4. **Vahidov Tacəddin Siracəddin oğlu** - Fizikanın tədrisi metodikası kafedrasının dosenti - “Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fəxri Fərmanı” ilə.

2014-cü ilin “İlin alimi” müsabiqəsinin nəticələri barədə ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev məlumat verib. Professor V.Əliyev bildirib ki, “İlin alimi” müsabiqəsi 3 nominasiya üzrə aparılıb. Müsabiqənin nəticələri aşağıdakı kimidir:

Humanitar və ictimai elmlər nominasiyası üzrə:

1. **Professor Buludxan Xəlilov** - I yer, 565 bal
2. **Professor Nizami Xudiyev** - II yer, 360 bal
3. **Professor Mais Əmrahov** - III yer, 260 bal
4. **Dosent Ramazan Qafarlı** - həvəsləndirici yer, 220 bal

Dəqiq və təbiət elmləri nominasiyası üzrə professor Rauf Sultanov 220 bal, dosent Cahangir Hüseynov 81 bal, professor Nailə Verdizadə isə 51 bal toplayıb. Professor Rauf Sultanov bu nominasiya üzrə I yerə layiq görülüb.

Pedaqoqika və metodika nominasiyası üzrə:

1. **Professor Fərrux Rüstəmov** - I yer, 593 bal
2. **Dosent Təranə Abdullayeva** - II yer, 388 bal

Qeyd edək ki, bu nominasiya üzrə professor Əbülfət Pələngov 168 bal, professor Əli Hüseynov isə 114 bal toplayıb.



ADPU-nun Tədris işləri üzrə prorektoru, professor M.Cəbrayılov Elmi Şuranın iclasında 2014-2015-ci tədris ilində keçirilmiş “İlin müəllimi” müsabiqəsinin nəticələri haqqında da məlumat verib. Prorektor M.Cəbrayılov bildirib ki, “İlin müəllimi” müsabiqəsinin qalibləri aşağıdakı şəxslər olmuşdur:

Humanitar fənlər nominasiyası üzrə:

1. **Professor Mübariz Əmirov** - I yer, 247,5 bal
2. **Dosent Həcər Hüseynova** - II yer, 230,5 bal
3. **Professor İramin İsayev** - III yer, 211,5 bal

Dəqiq və təbiət fənləri nominasiyası üzrə:

1. **Dosent Səadət Musayeva** - I yer, 262,5 bal
2. **Professor Məmməd Qarayev** - II yer, 172 bal
3. **Dosent Cahangir Hüseynov** - III yer, 170,2 bal

Tədris işləri üzrə prorektor, professor M.Cəbrayılov Elmi Şuranın iclasında həmçinin “2015-2016-cı il tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlıq haqqında” məruzə edib. Prorektor M.Cəbrayılov məlumat verərək bildirib ki, universitetdə hazırda ali təhsilin bakalavriat səviyyəsində Nazirlər Kabinetinin 12 yanvar 2009-cu il tarixli 8 nömrəli əmri ilə təsdiq olunmuş “Ali təhsilin bakalavriat pilləsi ixtisaslarının (proqramlarının) siyahısı”na uyğun olaraq 21 ixtisas üzrə mütəxəssis hazırlığı, ali təhsilin magistratura pilləsində isə 53 ixtisas üzrə elmi-pedaqoji kadr hazırlığı həyata keçirilir.

Oktyabr ayının 1-ə bakalavriat pilləsində təhsil alan tələbələrin ümumi sayı 8372 nəfər, o cümlədən əyani təhsil forması üzrə 6861 nəfər, qiyabi təhsil forması üzrə 1511 nəfər, magistratura pilləsində 885 nəfər, o cümlədən əyani təhsil forması üzrə 602 nəfər, qiyabi təhsil forması üzrə 283 nəfərdir. Bütövlükdə universitetdə 9257 nəfər tələbə təhsil alır.

ADPU-da tədris prosesi “Təhsil haqqında” Qanuna, “Ali təhsil müəssisələri haqqında Əsasnamə”yə, təhsillə bağlı proqram və qərarlara, Təhsil Nazirliyinin normativ-hüquqi sənədlərinə, əmr və göstərişlərinə, universitetin Nizamnaməsinə və universitetin ali idarəetmə orqanı-Elmi Şuranın qərarlarına uyğun olaraq qurulmuşdur. Universitetdə tədris prosesinin təşkilində Nazirlər Kabinetinin 24 dekabr 2013-cü il tarixli 348 nömrəli əmri ilə təsdiq edilmiş “Ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları”na ciddi surətdə əməl edilir.

Tədris prosesinə nəzarəti daha şəffaf təşkil etmək, informasiya-kommunikasiya texnologiyalarının tədris prosesinə tətbiqini daha da təkmilləşdirmək məqsədilə “İKT, Monitorinq və Qiymətləndirmə Mərkəzi” yaradılmış və imtahanların keçirilməsi bu quruma tapşırılmışdır. Tədris ilinin əvvəlində tələbələrin fərdi planı nəzərə alınmaqla, hər bir fənndən dərslərə davam edəcək tələbələr müəyyənləşdirilmiş, dərs cədvəlləri vaxtında tərtib və təsdiq edilmişdir. Fənn müəllimləri tərəfindən tələbələrin yerinə yetirəcəkləri sərbəst işlər müəyyənləşdirilərək onlara verilmişdir. Kafedralarda sərbəst işlərlə və imtahana hazırlıqla bağlı müəllimlərin məsləhət cədvəlləri elan edilmişdir. İmtahanqabağı kollokviumlar fənn müəllimləri (oktyabr və noyabr aylarında) və kompüter vasitəsilə dekabr ayında keçirilmişdir.

Hər tədris ilinin payız semestrində I tədris ilinə qəbul olmuş bakalavrlarla işə xüsusi diqqət yetirilir. Cari tədris ilinin başlanğıcında da I tədris ilinə qəbul olmuş bakalavrlar və onların valideynləri ilə fakültələrdə görüşlər keçirilmiş, kredit sisteminin mahiyyəti və kredit sistemi ilə tədrisin təşkili xüsusiyyətləri haqqında onlara məlumat verilmişdir. Bundan əlavə, “Ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları” çap edilərək tələbələrə çatdırılmışdır. Eyni zamanda I tədris ilinə qəbul olmuş, həmçinin universitetə bərpa olunmuş və ya köçürülmüş tələbələrin Kompüter Mərkəzində məlumat bazasına daxil edilmiş, onlarla treninqlərin keçirilməsi müvəffəqiyyətlə başa çatdırılmışdır.

İmtahan sessiyasının keçirilmə müddəti ixtisaslar üzrə tədris planlarının tədris prosesinin qrafiki bölməsinə uyğun olaraq əyani şöbədə 2016-cı il yanvar ayının 5-dən fevral ayının 1-dək, qiyabi şöbədə isə 2016-cı il yanvar ayının 5-dən yanvarın 15-dək keçirilməsi nəzərdə tutulmuşdur. İmtahanların sayı tədris planlarına müvafiq olaraq müəyyənləşdirilmişdir. Bakalavriat pilləsində bəzi spesifik fənlər istisna olmaqla, bütün imtahanlar kompüter vasitəsilə test üsulu ilə, magistraturada isə imtahanlar yazılı şəkildə keçirilir.

Tədris prosesinin tərkib hissəsi kimi imtahan sessiyalarına hazırlıq işləri mütəşəkkil qaydada həyata keçirilmişdir. Universitetdə bilavasi-

(Davamı 4-cü səhifədə)

# Elmi Şuranın iclası keçirilib

(Əvvəli 3-cü səhifədə)

tə imtahan sessiyasına hazırlıqla bağlı fakültə dekanlarının, kafedra müdirlərinin və digər aidiyyəti qurumların həyata keçirəcəkləri vəzifələri müəyyən edən müvafiq əmr verilmişdir. Əmrə uyğun olaraq tədris yüklərinin yerinə yetirilməsi vəziyyəti semestrin sonunda dekanlıqlar tərəfindən yoxlanılmış, jurnalların təlimata müvafiq bağlanması və tələbələrin imtahanqabağı ballarının hesablanması, tədris hissəsinə təhvil verilməsi və Kompüter Mərkəzində sistemə daxil edilməsi, universitetin saytında yerləşdirilməsi istiqamətində işlər davam etdirilir. Qeyd edək ki, testlər vaxtında hazırlanaraq "İKT, Monitorinq və Qiymətləndirmə Mərkəzi"nə təqdim edilmiş və universitetin İnternet saytında yerləşdirilmişdir. Eyni zamanda kafedralar imtahanlara düşən fənlərin proqramına uyğun sualları tərtib edərək tələbələrə elan etmiş və imtahan biletləri "İKT, Monitorinq və Qiymətləndirmə Mərkəzi"nə təqdim edilmişdir. Bundan əlavə, yazı işlərinin yoxlanılması üçün xüsusi otaq ayrılmışdır. İmtahan cədvəlləri "İKT, Monitorinq və Qiymətləndirmə Mərkəzi" tərəfindən imtahan tərtib edilmiş xarici ölkələrin tədris və tədqiqat müəssisələri ilə elmi əlaqələr qurub. Fakültədə ali təhsilin magistratura və doktorantura pillələri üzrə kadr hazırlığı həyata keçirilir. Fakültənin çoxlu sayda tələbəsi Tələbə Elmi Cəmiyyətinin xətti ilə həm universitetdə, həm də respublika miqyasında keçirilən elmi konfranslarda, seminarlarda uğurla iştirak edərək iştirakçı sertifikatları və diplomlarla təltif ediliblər. Onlar həm də müxtəlif qrant layihələri müsabiqələrində iştirak ediblər.

Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin tələbələri idman sahəsində də diqqətəlayiq uğurlar qazanıblar. Bunlarla yanaşı, fakültə müxtəlif konfranslar, elmi seminarlar, təqdimat mərasimləri, anım mərasimləri və digər ictimai-mədəni tədbirlər həyata keçirib ki, bu tədbirlər də öz növbəsində tələbə-gənclərin elmi biliklərinin artmasına, dünyagörüşünün genişlənməsinə, eyni zamanda milli ruhda, əsl vətənpərvər kimi tərbiyə olunmalarına səmərəli təsir göstərib. Fakültənin tələbəgəncləri pedaqoji təcrübələrdə də fəal iştirak edirlər. Fakültənin professor-müəllim heyəti, əməkdaşları və tələbə kollektivi gələcəkdə öz fəaliyyətini daha əzmlə davam etdirəcəkdir.



və təsdiq olunmuşdur. İmtahanlara nəzarət edəcək imtahan rəhbərləri və qeyri-ixtisas nəzarətçi müəllimlərlə bağlı təqdimatlar fakültə dekanlıqları tərəfindən vaxtında təqdim edilmiş, müvafiq əmr verilmişdir. Universitetdə "İmtahan qərargahı", fakültələrdə Münaqişə Komissiyaları yaradılmışdır. Payız semestrinin imtahan sessiyasına hazırlıqla əlaqədar verilmiş bütün əmrlər və digər zəruri məlumatlar universitetin saytında yerləşdirilmişdir. İmtahan sessiyasının mütəşəkkil və şəffaf keçirilməsi üçün fakültələrin Elmi Şuralarının geniş tərkibdə iclasları keçirilmişdir. Bunlarla yanaşı, "İKT, Monitorinq və Qiymətləndirmə Mərkəzi" tərəfindən test imtahanlarından sonra yazılı imtahanlara girəcək tələbələrin siyahısının çevik şəkildə dekanlıqlara verilməsi zəruridir.

Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin hesabatı ilə fakültənin dekanı, dosent Mətanət Əsgərova çıxış edib. Dekan M.Əsgərova məlumat verərək bildirib ki, bu ilin noyabr ayınadək Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsində 4 kafedra - Ümumi coğrafiya kafedrası, Fiziki coğrafiya və ekologiya kafedrası, İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrası, Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası kafedrası fəaliyyət göstərib. Elmi Şuranın müvafiq qərarı əsasında Ümumi coğrafiya və Fiziki coğrafiya və ekologiya kafedraları birləşdirilərək yeni - Ümumi coğrafiya kafedrası yaradılıb. Fakültədə 4 ixtisas - Coğrafiya müəllimliyi, Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq müəllimliyi, Menecment (Təhsilin təşkili və idarə olunması) və Ekologiya ixtisasları tədris olunur. Builki tədris ilində fakültəyə 173 nəfər tələbə qəbul olmuşdur. Hazırda fakültədə 663 nəfər tələbə təhsil alır. Onlardan 574 nəfəri əyani şöbədə, 89 nəfəri isə qiyabi şöbədə təhsil alır. Fakültədə professor-müəllim heyətinin sayı 55 nəfərdir. Onlardan 1-i akademik, 2-si elmlər doktoru, 2-si professor, 22-si fəlsəfə doktoru, 1-i dosent, 10-u baş müəllim, 17-si müəllimdir. Son illər fakültənin professor-müəllim heyəti tədrislə yanaşı, öz elmi-tədqiqatlarını da kəmiyyət və keyfiyyət baxımından genişləndiriblər. Fakültədə 25 nəfər tədris-köməkçi heyəti çalışır. Son 4 ildə fakültənin professor-müəllimlərinin 7 monoqrafiyası, 11 dərsliyi, 15 dərs vəsaiti, 64 proqram və metodik vəsaiti nəşr olunub. Fakültənin professor-müəllimləri respublika və beynəlxalq miqyasda keçirilən konfranslarda fəal iştirak edərək uğurlu nəticələr əldə edirlər. Fakültə Azərbaycanın və bir çox

"Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının (ETL) hesabatı ilə ETL-in müdiri, dosent Ramazan Qafarlı çıxış edib. Dosent R.Qafarlı qeyd edib ki, "Dədə Qorqud" ETL-sı 2000-ci ildən fəaliyyət göstərir. Laboratoriyanın 21 əməkdaşı vardır. "Dədə Qorqud" ETL-də 3 bölmə fəaliyyət göstərir: Folklor-etnoqrafiya-mifologiya bölməsi; Onomastika-etimologiya-dialektologiya bölməsi; Pedaqoji-psixoloji-fəlsəfi araşdırmalar bölməsi. Bu il laborato?riyanın 14 əməkdaşı, o cümlədən 8 kiçik elmi işçisi, 1 elmi işçisi və 5 böyük elmi işçisi elmi-tədqiqat işinə cəlb olunmuşdur.

Hesabat dövründə "Dədə Qorqud" ETL-in əməkdaşları müxtəlif istiqamətlərdə elmi araşdırmalar aparıblar və hazırda da bu istiqamətlərdə öz fəaliyyətlərini davam etdirirlər. ETL-də həyata keçirilən bütün elmi-tədqiqat işləri laboratoriyanın təsis etdiyi "Dədə Qorqud araşdırmaları" jurnalının 4-cü sayında (Bakı, ADPU-nun nəşriyyatı, 2015. 256 s.) dərc olunmuşdur. Elmi-tədqiqat laboratoriyasının müdiri, dosent R.Qafarlı 8 nəfərə, o cümlədən 3 filologiya üzrə elmlər doktoruna məsləhətçilik, 5 fəlsəfə doktoruna rəhbərlik etmişdir. Hesabat dövründə laboratoriyanın əməkdaşları beynəlxalq və respublika miqyaslı elmi konfranslarda iştirak etmiş və uğurlu nəticələr əldə etmişlər.

"Dədə Qorqud" ETL-in bəzi əməkdaşları bu il Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun qrant layihələrini udmuşlar. Tələbələrin TEC-in xətti ilə elmi işlərə cəlb edilməsində də diqqətəlayiq işlər görülmüşdür.

Qeyd etdiklərimizlə yanaşı, "Dədə Qorqud" ETL-in əməkdaşları bu il noyabr ayının 19-20-də ADPU-da "Kitabi-Dədə Qorqud" eposunun yazıya alınmasının 200 illiyinə həsr olunmuş "Türk epos düşüncəsi yazılı mənbələrdə" mövzusunda keçirilən Respublika elmi konfransında, həmçinin noyabrın 26-27-də Xalq şairi Bəxtiyar Vahabzadənin 90 illik yubileyinə həsr olunmuş "İnsan və zaman" mövzusunda keçirilən Respublika elmi-praktik konfransında fəal iştirak etmişlər.

Elmi Şura üzvləri Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin dekanı, dosent Mətanət Əsgərovanın və "Dədə Qorqud" ETL-in müdiri, dosent Ramazan Qafarlının hesabat məruzələrini qənaətbəxş hesab edərək hər iki hesabat məruzəsinin qəbul edilməsi lehinə səs veriblər.

Elmi Şuranın iclasında cari məsələlər də müzakirə olunub və müvafiq qərarlar qəbul edilib.

**Mənsur İBRAHİMLİ**

# Tələbə Elmi Cəmiyyətinin 73-cü elmi konfransı keçirilib

**Dekabr ayının 25-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Tələbə Elmi Cəmiyyətinin(TEC) xalqımızın ümummilli lideri Heydər Əliyevin 92 illik yubileyinə həsr olunmuş 73-cü elmi konfransı keçirilib.**



ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev konfransı giriş sözü ilə açaraq bu elmi tədbirin gənc nəslin azərbaycançılıq ruhunda tərbiyə olunmasında mühüm əhəmiyyəti olduğunu bildirib. Professor V.Əliyev çıxışı zamanı ulu öndər Heydər Əliyevin Azərbaycan gəncliyi qarşısında göstərdiyi böyük xid-mət-lərdən söz açıb, ölkəmizin gələcəyinin gənclərdən asılı olduğunu, bu və ya digər sahələrdə ali təhsilini başa vurmuş yüzlərlə istedadlı gəncin tez bir zamanda alim-lik dissertasiyaları mü-dafiə edərək təkcə



Azərbaycanda deyil, eləcə də xarici ölkələrdə uğurla çalışaraq ölkəmizin şərəfini ucal-dacaqlarına inandığını vurğulayıb.

Xalqımızın görkəmli alimi, təcrübəli elm və təhsil təşkilatçısı, ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov universitetdə elmi-tədqiqat işlərinin genişlənməsinə, aparılan elmi araşdırmaların səviyyəsinin yüksəlməsinə xüsusi qayğı və diqqət göstərir.

Qeyd edək ki, hazırda ADPU-nun 10 fakültəsində TEC fəaliyyət göstərir. Hər bir fakültədə "yaxşı" və "əla" qiymətlərlə oxu-yan tələbələr təcrübəli pro-fes-sor və dosentlərin rəhbərliyi altında elmi-tədqiqat işləri apa-rırlar. İldə bir dəfə bütün fakültələrdə tələbələrin el-mi konfransı keçirilir və tələbə-gənclərin elmi-tədqiqat işlərinin nəticələri ayrıca toplu şəklində çap olunur. TEC-in xətti ilə elmi-təd-qi-qat iş-ləri aparan tələbələrin ən yaxşı işləri ali məktəblərin gənc tədqiqatçılarının hər il keçirilən ənə-nə-vi ümumrespublika kon-fransına təqdim edilir.

Bu gün milli təhsil sistemimiz kəmiyyət və keyfiyyət baxımından sürətlə in-ki-şaf edir. Bu inkişaf ADPU-da da aydın görünür. Son bir ildə TEC-in xətti ilə ayrı-ayrı fakültələrdə, eləcə də müxtəlif bölmələrdə elmi-tədqiqat işləri aparan tə-lə-bələrin artım dinamikası aşağıdakı kimidir:

Filologiya fakültəsi-24, Fizika və riyazi texniki fənlər fakültəsi-19,Coğrafiya və gənclərin çağırışaqədərki hazırlığı fakültəsi-35, Riyaziyyat və informatika fakültəsi-27, Biologiya fa-kül-təsi-69, Tarix fakültəsi-29, Kimya fakültəsi-33, pedaqogika bölməsi üzrə 47, psixologiya bölməsi üzrə 26, musiqi bölməsi üzrə 56.

Sonra konfrans öz işini 10 bölmə üzrə davam etdirib, tələbələrin elmi- tədqiqat işləri dinlənilib və ən yaxşı tələbə elmi işi mükafat üçün təqdim edilib.

**Almarə Abbasova,**
**"Elm və innovasiyalar şöbəsi"nin mütəxəssisi**

# ADPU-da "Ağ qayıq" tamaşası nümayiş etdirilib

Dekabr ayının 15-də Şuşa Dövlət Musiqili Dram Teatrının kollektivi Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında universitetin professor-müəllim heyəti və tələbələri üçün "Ağ qayıq" tamaşasını nümayiş etdirib. Tamaşa başlamazdan öncə "Ağ qayıq" tamaşasının ssenari müəllifi Enurə Abdullayeva ADPU-nun rəhbərliyinə tamaşanın universitetdə nümayiş etdirilməsi üçün göstərdiyi köməyə görə Şuşa Dövlət Musiqili Dram Teatrının kollektivi və şəxsən öz adından təşəkkür edib.



Qeyd edək ki, "Ağ qayıq" tamaşası 2009-cu ildə dövlət sifarişi əsasında hazırlanaraq teatrın repertuarına daxil edilmişdir. Bu tamaşada



Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ müharibəsinin faciələrindən, bu müharibənin insanlara vurduğu mənəvi zərbələrdən bəhs edilir.

Tamaşada bir-birini dəlicəsinə sevən iki gənc-Ağgüllə Camal həyat eşqi ilə alışıb-yanır, gələcəyə nikbin nəzərlərlə baxır və hər şeyin yaxşı olacağına inanırlar. Lakin Camalın müharibəyə getməsi onların bütün arzularını məhv edir. Camaldan heç bir soraq çıxmadığına görə hamı onu müharibədə şəhid olmuş bilir. Vəfalı və fədakar Ağgül isə hər an sevgilisinin yolunu gözləyir, yenidən onunla görüşəcəyinə, ona qovuşacağına bütün varlığı ilə inanır. Nə yaxşı ki, bu inamı onu aldatmır və bir təsadüf nəticəsində onlar yenidən görüşürlər. Bu görüş çox ağır, kədərli, əzablı bir görüş olur. Amma bir zamanlar ağ dəftər vərəqindən qayıq düzəldərək, öz tükənməz arzularını da bu qayıqlarla birlikdə dənizin sonsuz ənginliklərinə yola salarkən bağladıqları əhd-peymana, içdikləri anda sədaqət onların yenidən qovuşmasına səbəb olur. Onu da qeyd edək ki, istər Ağgül, istərsə də Camal hər gün rastlaşdığımız-tanıdığımız yüzlərlə insanın ümumiləşdirilmiş obrazıdır. Tamaşada videosüjetlərdən istifadə olunması da onun təsir gücünü artırmışdır.

Vətənpərvərlik mövzusunda çəkilmiş "Ağ qayıq" tamaşası professor-müəllim heyəti və tələbə-gənclər tərəfindən razılıq hissi ilə qarşılanıb.

**Könül NƏZƏROVA**

# "Dünyanı səslərlə kəşf edək" adlı elmi seminar keçirilib

Dekabr ayının 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik akt zalında Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Tələbə Elmi Cəmiyyətinin (TEC) 3 Dekabr-Beynəlxalq Əlillər Gününə həsr olunmuş "Dünyanı səslərlə kəşf edək" adlı elmi seminarı keçirilib. Elmi seminarda ADPU-nun Elmi işlər üzrə prorektoru, professor Vilayət Əliyev iştirak edib.

Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin dekanı, dosent Şəhla Əliyeva elmi seminarı giriş sözü ilə açaraq bu tədbirin aktual bir mövzuya həsr olunduğunu bildirib. Dosent Şəhla Əliyeva qeyd edib ki, 3 Dekabr-Beynəlxalq Əlillər Günü Azərbaycanda xalqımızın ümummilli lideri Heydər Əliyevin imzaladığı müvafiq Sərəncamla 1994-cü ildən keçirilir.

Dosent Ş.Əliyeva çıxışında qeyd edib ki, bu ilin oktyabr ayından ADPU-da Korreksiyaedici təlim kafedrası fəaliyyətə başlayıb. Bu kafedranın fəaliyyətə başlamasını mühüm və əlamətdar hadisə hesab edən dosent Ş.Əliyeva buna görə universitetin rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədova fakültənin professor-müəllim heyəti və tələbə kollektivi adından təşəkkür edib.

Dosent Ş.Əliyeva çıxışına davam edərək bildirib ki, hazırda dünya əhalisinin təxminən 15%-ni əlil insanlar təşkil edir. Əlilliyi olan insanların 20%-i inkişaf etməkdə olan ölkələrdə yaşayır. Azərbaycanda isə əhalinin 5%-i əlilliyi olan şəxslər, sağlamlıq imkanları məhdud uşaqlardır. Ölkəmizdə əlil insanların artmasına Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi də ciddi təsir göstərib. Bu gün respublikamızda 60 mindən çox əlil uşaq var. Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bütün kateqoriyadan olan əlillərə, o cümlədən əlil uşaqlara böyük qayğı və diqqət göstərir. Eyni zamanda Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Milli Məclisin deputatı, YAP-ın Sədr müavini, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın şəxsi təşəbbüsü, diqqət və qayğısı sayəsində son illər həyata keçirilən sosial layihələr nəticəsində əlillərin sosial müdafiəsi sahəsində müsbət dəyişikliklər baş verib. Bir çox əlil evləri əsaslı təmir olunub, müasir standartlara tam uyğun olan yeni bərpa mərkəzləri yaradılıb, əlillərin müalicəsi və təhsil hüquqlarının reallaşması istiqamətində məqsədyönlü səmərəli fəaliyyət həyata keçirilib. Respublikamızda əlil uşaqlar üçün xüsusi təhsil müəssisələri fəaliyyət göstərir. Bir sözlə, ölkəmizdə əlillərə yüksək səviyyədə qayğı və diqqət göstərilməsi dövlət siyasətinin əsas istiqamətlərindən biridir.



Elmi seminarda Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin Korreksiyaedici təlim kafedrasının baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Səbinə Aslanova və həmin kafedranın baş müəllimi, pedaqogika üzrə fəlsəfə doktoru Nailə Hüseynova çıxış edərək bugünkü tədbirin tələbə-gənclərin maarifləndirilməsi baxımından mühüm əhəmiyyət kəsb etdiyini bildiriblər.

Elmi seminarda "Korreksiyaedici təlimin metodika və metodologiyası" ixtisası üzrə təhsil alan II kurs magistrantları Sürayyə Mustafayeva "Azərbaycan Respublikasında sağlamlıq imkanları məhdud uşaqlara göstərilən diqqət və qayğı", Sevda Məhərrəmova "Eşitmə orqanı və onun anatomik quruluşu", Ülviyyə Əsədova "Eşitmə orqanının patologiyaları", Aişə Şərifova "Eşitmə pozulmaları", Bəyim Həsənova "Kar və zəif eşidənlərdə eşitmə cihazları və implantlar", Sülhanə Bəşirova "Eşitmə pozulmalarının diaqnostikası", Günay Bədəlzadə "Koxlear implant əməliyyatı", Səmra Bayramova "Koxlear implantasiyadan sonra reabilitasiya" mövzularında çıxış edərək öz elmi fikir və mülahizələrini bölüşüblər.

Elmi işlər üzrə prorektor, professor V.Əliyev çıxış edərək seminarın keçirilməsinə görə Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin rəhbərliyinə, professor-müəllim heyətinə, tələbə-gənclərinə öz təşəkkürünü bildirib və onlara uğurlar arzulayıb.

**Mətbuat və informasiya şöbəsi**



# 10 Dekabr - Beynəlxalq İnsan Hüquqları Gününə həsr edilmiş tədbir keçirilib

Dekabr ayının 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik akt zalında 10 Dekabr-Beynəlxalq İnsan Hüquqları Gününə həsr edilmiş tədbir keçirilib. ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru, hüquq üzrə fəlsəfə doktoru, dosent Mehdi Abdullayev tədbiri açaraq tələbə-gənclərə bu günün yaranma tarixi, insan və vətəndaş hüquq və azadlıqlarının mahiyyəti barədə ətraflı məlumat verib. Prorektor M.Abdullayev bildirib ki, ilk dəfə Fransada 1789-cu ildə "İnsan və vətəndaş hüquqları bəyannaməsi" qəbul edilmişdir. 10 Dekabr-Beynəlxalq İnsan Hüquqları Günü Birləşmiş Millətlər Təşkilatı tərəfindən 1948-ci il dekabr ayının 10-da qəbul olunmuş "Ümumdünya İnsan Hüquqları Bəyannamə"sinə əsasən keçirilir. 1950-ci ildən başlayaraq 10 dekabr bütün dünyada insan hüquqları günü kimi qeyd edilir. "Ümumdünya İnsan Hüquqları Bəyannamə"si XX əsrdə insan hüquqları sahəsində əsas sənəddir. Qeyd edək ki, 1966-cı ildə BMT tərəfindən həm də "Vətəndaşlıq və siyasi hüquqlar haqqında beynəlxalq pakt", həmçinin "İqtisadi, sosial və mədəni hüquqlar haqqında pakt" qəbul edilmişdir. Avropada insan hüquqlarının və azadlığının qorunması üçün Avropa Konvensiyası mövcuddur. Avropada həm də Avropa İnsan Hüquqları Məhkəməsi fəaliyyət göstərir.




Prorektor M.Abdullayev çıxışına davam edərək bildirib ki, insan və vətəndaş hüquq və azadlıqları demək olar ki, dünyanın bütün ölkələri tərəfindən qəbul edilir. Konstitusiyalarda əsas hüquqların və beynəlxalq razılaşmaların köməyi ilə insan hüquqları inkarolunmaz bir hüquq kimi qəbul edilmişdir. Beynəlxalq aləmdə insan hüquqları BMT-nin adıçəkilən Bəyannaməsi ilə qanunləşdirilmişdir. İnsan hüquqları dedikdə ilk növbədə, bütün insanların bərabər hüquqlara malik olması nəzərdə tutulur. Hüquq normalarının dövlət tərəfindən qorunması onu digər normalardan fərqləndirən əsas xüsusiyyətdir.

Hər bir insan irqi mənsubiyyətindən, cinsindən, dilindən, dinindən, siyasi və digər baxışlarından, milli və sosial mənşəyindən, mülkiyyətindən asılı olmayaraq, eyni hüquqlara malikdir.

Xalqımızın böyük oğlu, ümummilli liderimiz Heydər Əliyev həmişə öz idarəçilik və dövlətçilik fəaliyyətində insan və vətəndaş hüquq və azadlıqlarının təmin edilməsinə xüsusi diqqət yetirmişdir. Ulu öndər Heydər Əliyevin rəhbərliyi ilə hazırlanmış və 1995-ci il noyabr ayının 12-də ümumxalq səsverməsi yolu ilə qəbul edilmiş müstəqil Azərbaycan Respublikasının ilk Konstitusiyasında insan və vətəndaş hüquq və azadlıqlarına geniş yer verilmişdir. Belə ki, Konstitusiyanın 158 maddəsindən 48-i insan hüquq və azadlıqlarına və onların təminatlarına həsr edilmişdir. Konstitusiya ölkədə demokratik, hüquqi, dünyəvi və unitar dövlət qurulması işinə hüquqi zəmin yaratmışdır.

Ulu öndər Heydər Əliyevin müdrik və mütərəqqi siyasi kursunu uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev ölkəmizdə insan və vətəndaş hüquq və azadlıqlarının yüksək səviyyədə təmin edilməsi üçün bütün zəruri tədbirlər həyata keçirir.

Prorektor M.Abdullayev qeyd edib ki, Konstitusiyada cəmiyyətin demokratikləşdirilməsinə və vətəndaş cəmiyyətinin bərqərar olmasına nail olmaq, qanunların aliliyini təmin edən hüquqi, dünyəvi dövlət qurmaq, sərbəst iqtisadi münasibətlərin formalaşmasını təmin etmək və s. kimi dünyəvi prinsiplər təsbit olunmuşdur. Azadlıq - cəmiyyətin digər üzvlərinə zərər yetirməyən hər şeyi etmək imkanıdır. Azadlığın sərhədləri yalnız qanunla müəyyənləşdirilə bilər, yəni azadlıq qanun çərçivəsində verilən sərbəstlikdir. Qanun insan hüquqlarını istənilən pozuntudan qorumağa yönəldilmişdir. İnsan hüquqlarının və əsas azadlıqlarının beynəlxalq hüququn prinsiplərinə uyğun olaraq təmin edilməsi dövlətimizin ali məqsədi kimi təsbit edilmişdir.

Azərbaycanda baş vermiş dəyişikliklər, demokratik dəyərlərin inkişafına yönəldilmiş bir sıra islahatlar öz əksini Konstitusiyada tapmışdır. Bu dəyişikliklərlə əlaqədar olaraq 2002-ci il avqustun 24-də və 2009-cu il martın 18-də Konstitusiyaya əlavə və dəyişikliklər edilməsinə dair referendumlar keçirilmiş, xalqın iradəsinin nəticəsi olaraq Əsas Qanuna zəruri dəyişiklik və əlavələr edilmişdir. Bu əlavə və dəyişikliklər Azərbaycanda hüquqi, demokratik, dünyəvi dövlət quruculuğuna və vətəndaş cəmiyyətinin inkişafına öz töhfələrini vermişdir.



Tədbirdə tələbə-gənclərin sualları cavablandırılıb.

**Könül NƏZƏROVA**

# ADPU-nun Quba filialında 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə silsilə tədbirlər keçirilib

İlk olaraq onu qeyd edək ki, dekabr ayının ortalarında Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialının "Oxucu" divar qəzetində 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə məqalə və təbrik yazıları dərc olunub.



Dekabr ayının 24-də isə "Mübarək" sarayında ADPU-nun Quba filialının müəllim, tələbə və işçi kollektivinin iştirakı ilə 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə şənlik keçirilib. Tədbirdə ADPU-nun Quba filialının direktoru, professor Əli Allahverdiyev çıxış edərək bütün kollektivi 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə səmimi-qəlbdən təbrik edib, qarşıdan gələn 2016-cı ilin xalqımız və dövlətimiz üçün daha uğurlu bir il olmasını arzulayıb. Tədbir tələbə-gənclərin hazırladıqları və nəğməli qonaqların, saz ifaçısının rəng qatdığı bədii hissə ilə davam edib.

Qeyd etdiklərimizlə yanaşı, dekabrın 28-də ADPU-nun Quba filialının yataqxanasında "Ən yaxşı otaq" müsabiqəsi keçirilib. Bu müsabiqə zamanı 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününün və Yeni il rəmzlərinin əksini tapdığı TSPX ixtisası üzrə IV kurs tələbəsi Mətanət Mustafazadənin yaşadığı otaq qalib gəlib, tələbə rəğbətləndirilib.

Dekabrın 29-da isə "Quba Yay" sarayında 31 Dekabr-Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təşkil olunmuş ümumrayon tədbirində idarə, müəssisə və təşkilat rəhbərləri, həmçinin ADPU-nun Quba filialının direktoru, professor Ə. Allahverdiyev, tədris və elmi işlər üzrə direktor müavini, tarix üzrə fəlsəfə doktoru İsmayıl Mahmudov, tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva iştirak ediblər. Qeyd edək ki, tədbir maraqlı anlarla yadda qalıb.

**Mətbuat və informasiya şöbəsi**

# Rəhim İbrahim oğlu Əliyev



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. İstedadlı və tanınmış tarixçi alim, təcrübəli təhsil işçisi, humanist və qayğıkeş insan, tarix üzrə elmlər doktoru, Azərbaycan tarixi kafedrasının professoru, Əməkdar müəllim Rəhim İbrahim oğlu Əliyev dekabr ayının 29-da 79 yaşında uzun sürən xəstəlikdən sonra vəfat etmişdir. Onun mənalı həyat yolu və elmi-pedaqoji fəaliyyəti gənclər üçün bir nümunədir.

Rəhim Əliyev 1936-cı il aprel ayının 10-da Qərbi Azərbaycanın Göyçə mahalının Basarkeçər rayonunun Qaraiman kəndində anadan olmuşdur. 1948-1953-cü illərdə qərbi azərbaycanlılarının öz tarixi ata-baba yurdlarından növbəti dəfə deportasiya edilməsi nəticəsində R.Əliyev ailəsi ilə birlikdə 1953-cü ilin may ayında Azərbaycanın Tərtər rayonunda məskunlaşmışdır. İbtidai təhsilini Göyçə mahalının Basarkeçər rayonunun Qaraiman kəndində alan R.Əliyev təhsilini Tərtər rayonunda davam etdirmişdir. 1956-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Tarix-filologiya fakültəsinə qəbul olmuş, 1961-ci ildə bu ali məktəbi fərqlənmə diplomu ilə bitirmişdir. O, həm də Marksizm-Leninizm Universitetinin Fəlsəfə şöbəsində təhsil almışdır.

R.Əliyev ali təhsil aldıqdan sonra təyinatla Tərtər rayonunda üç il müəllim və məktəb direktoru işləmişdir. Sonra isə Bakı şəhərinin Qaradağ Rayon Təhsil Şöbəsində müfəttiş və 166 nömrəli tam orta məktəbdə tarix müəllimi kimi fəaliyyət göstərmişdir.

1971-ci ildə müsabiqə yolu ilə ADPİnin Azərbaycan tarixi kafedrasına müəllim vəzifəsinə seçilmişdir. R.Əliyev 1973-cü ildə "Müharibədən sonrakı illərdə Azərbaycanda orta ixtisas təhsilli kadrların hazırlanması (1945-1965-ci illər)" mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək tarix elmləri namizədi (indi fəlsəfə doktoru) elmi dərəcəsi almışdır. Dissertasiya müdafiəsindən sonra 1973-cü ildə kafedrada baş müəllim, 1979-cu ildə dosent işləmişdir.

R.Əliyev 1976-1984-cü illərdə Tarix fakültəsində dekan müavini, 11 il isə dekan vəzifəsində çalışmışdır. 1981-ci ildə "SSRİ-nin Ali məktəb əlaçısı" döş nişanı ilə təltif edilmiş, 2002-ci ildə "İlin ziyalısı" seçilmişdir. Professor R.Əliyev bütövlükdə 8 nəfərin namizədlik dissertasiyasının rəsmi opponenti olmuşdur. 50 ilə yaxın pedaqoji staja malik olan R.Əliyev 26 əsərin, o cümlədən 17 məqalənin, 5 dərs vəsaitinin, 2 dərslik və Tarix fakültələri üçün 2 proqramın müəllifidir.

Professor R.Əliyev əlavə rəy üçün kənardan kafedraya daxil olan namizədlik və doktorluq dissertasiyalarının müzakirəsində fəal iştirak etmişdir. O, ictimai-siyasi həyatda da fəal idi. Azərbaycan televiziyasında "Azərbaycan tarixi" verilişini aparır, televiziya və radioda aktual mövzularda çıxışlar edirdi.

Professor R.Əliyevin elmi-pedaqoji fəaliyyəti ölkə rəhbərliyi tərəfindən layiqincə qiymətləndirilmişdir. O, səmərəli pedaqoji fəaliyyətinə görə 2001-ci ildə "Azərbaycan Respublikasının Əməkdar müəllimi" fəxri adına layiq görülmüşdür. Ümumiyyətlə, son dərəcə vətənpərvər, millətsevər, xeyirxah və təvazökar, özünə və digərlərinə qarşı həm tələbkar, həm də qayğıkeş bir insan idi. Professor R.Əliyev universitet rəhbərliyinin, kafedra əməkdaşlarının, fakültənin professor-müəllim heyətinin və tələbə kollektivinin dərin hörmətini qazanmışdı. Rəhim müəllimin əziz xatirəsi həmişə qəlbimizdə yaşayacaqdır.

***Allah rəhmət eləsin!***

**ADPU-nun kollektivi**

# Unudulmayan müəllim-alim



Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kollektivinə ağır itki üz vermişdir. İstedadlı tarixçi alim, bacarıqlı təhsil işçisi, xeyirxah və təvazökar insan, tarix üzrə elmlər doktoru, Azərbaycan tarixi kafedrasının professoru Əli Mahmud oğlu Məmmədov dekabr ayının 9-da 73 yaşında uzun sürən xəstəlikdən sonra vəfat etmişdir. Əli Məmmədov 1942-ci ildə Cəbrayıl rayonunun Şahvəli kəndində anadan olmuşdur. İlk təhsilini həmin kənddə alan Ə.Məmmədov sonradan Soltanlı kənd orta məktəbində oxumuş və həmin məktəbi "əla" qiymətlərlə bitirmişdir. O, 1967-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun (indiki ADPU-nun) Tarix fakültəsinə daxil olmuşdur. Tələbə olarkən institut və respublika üzrə keçirilən elmi konfrans və digər elmi tədbirlərdə fəal iştirak etmiş, dəfələrlə fəxri fərman və diplomlara layiq görülmüşdür.

1971-ci ildə ADPU-nu fərqlənmə diplomu ilə bitirən Ə.Məmmədov təyinatla 3 il Salyan və Abşeron rayonlarında tarix müəllimi işləmiş, qabaqcıl pedaqoq kimi ictimaiyyətin rəğbətini qazanmışdır. Eyni zamanda bitirdiyi ali təhsil müəssisəsi ilə sıx əlaqə saxlamış, universitetin keçirdiyi tədbirlərdə yaxından iştirak etmişdir.

Ə.Məmmədov 1976-cı ildə ADPU-nun aspiranturasına daxil olmuşdur. O, "Azərbaycan fəhlə sinfinin istehsalın idarə olunmasında respublika partiya təşkilatının rolu" mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək tarix elmləri namizədi (indi fəlsəfə doktoru) elmi dərəcəsi almışdır.

1997-ci ildən ADPU-nun Azərbaycan tarixi kafedrasında çalışan Ə.Məmmədov istedadlı pedaqoq-alim və fəal ictimaiyyətçi kimi böyük nüfuz qazanmışdır. "Bilik" Cəmiyyətində mühazirəçisi kimi fəaliyyət göstərərkən ulu öndərimiz Heydər Əliyevin Azərbaycana rəhbərliyi dövründəki xidmətlərini yüksək səviyyədə dinləyicilərə çatdırmışdır.

Ə.Məmmədov 2005-ci ildə "Müstəqil Azərbaycan dövlətinin bərpası və möhkəmləndirilməsi" mövzusunda dissertasiya müdafiə edərək tarix elmləri doktoru elmi dərəcəsinə layiq görülmüşdür. 1999-cu ildə çap etdirdiyi 23 çap vərəqi, 360 səhifəlik monoqrafiyasında Sovet sisteminin çökməsi səbəbləri, M.Qorbaçovun antiazərbaycan siyasəti və onun havadarlığı sayəsində ermənilərin Azərbaycan torpaqlarını işğal etməliri, müstəqillik uğrunda mübarizənin çətin yolu və digər məsələlər ilk mənbələr əsasında işıqlandırılmışdır.

14 kitabın, 70-dən çox məqalənin müəllifi olan professor Ə.Məmmədov öz əsərlərində respublika həyatının ən aktual və rəngarəng problemlərinin, xüsusilə də, Azərbaycanın müstəqilliyi uğrundakı mübarizədə böyük fədakarlıq göstərən şəxslərinin rolunun işıqlandırılmasına xüsusi diqqət yetirmişdir. Vətənpərvər tarixçi alim Ə.Məmmədovun əsərlərində dəfələrlə ulu öndər Heydər Əliyevin müasir müstəqil Azərbaycanın memarı və qurucusu olması, ölkəmizdə əmin-amanlığı, sabitliyi təmin etməsi və iqtisadi inkişaf yoluna çıxarması fikri xüsusi vurğulanmışdır.

Professor Ə.Məmmədovun 15 ildən çox Nazirlər Sovetinin sədri vəzifəsində işləmiş Teymur Quliyevə həsr etdiyi "Teymur Quliyevin fəaliyyəti" adlı monoqrafiyasını, həmçinin "Qərbdə və Rusiyada ictimai-siyasi hərəkatlar", "Azərbaycanda milli-azadlıq hərəkatı" adlı dərs vəsaitlərini Vətən tarixi elminə qiymətli hədiyyə hesab etmək olar.

Professor Ə.Məmmədov ömrünün 40 ilini bitirdiyi ali məktəbdə - ADPU-da keçirmişdir. Təcrübəli pedaqoq-alim, səmimi və xeyirxah insan, gözəl ailə başçısı olmuş Ə.Məmmədovun xatirəsi həmişə qəlbimizdə yaşayacaqdır.

***Allah rəhmət eləsin!***

**Xəlil Köçərli,**
**Azərbaycan tarixi kafedrasının professoru, Əməkdar müəllim**

# ADPU-nun Quba filialında "Ədəbiyyat kuboku" layihəsinin açılış mərasimi keçirilib

2015-ci il Azərbaycan ədəbiyyatında özünəməxsus yer tutan bir sıra yazıçı və şairlərin yubileyləri ilə əlamətdardır. Bu il Bəxtiyar Vahabzadənin 90, Yusif Səmədoğlunun 80, Əliağa Vahidin 120, Məhəmmədhüseyn Şəhriyarın 110, Seyid Əzim Şirvaninin 180 illik yubileyləri qeyd olunur. Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun maliyyə dəstəyi ilə "Qubada gənclər arasında Azərbaycan ədəbiyyatının təbliği və gənclər arasında mütaliə bacarıqlarının artırılması" istiqamətində intellektual çoxnövçülük üzrə "Ədəbiyyat kuboku" adlı layihəyə start verilib. Layihə çərçivəsində gənclər arasında "Xəmsə", "Fərdi oyun", "Breynrinq" kimi intellektual oyunlar üzrə yarışlar keçiriləcək. Sırf ədəbiyyat mövzularını əhatə edəcək yarışlar bacarıqlı gənclərin üzə çıxarılmasına təkan verəcək.




Bu məqsədlə ADPU-nun Quba filialında 18 dekabr 2015-ci il tarixində layihənin açılış mərasimi təşkil edilib. Layihənin açılış mərasimində iştirak edən qonaqlar - Azərbaycan Respublikasının Prezidenti yanında Gənclər Fondunun baş məsləhətçisi Vüsalə Niftəliyeva, Quba Rayon Gənclər və İdman İdarəsinin əməkdaşı Xəyyam Şahbazov, layihənin tərəfdaşı olan "Yurd" Gənclərin İntellektual İnkişafına Dəstək İctimai Birliyinin sədri Ramin Mahmudov, Qubada fəaliyyət göstərən "Səyyar Asan Xidmət"in rəhbəri Araz Hüseynov, ADPU-nun Quba filialının Tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva, Ədəbiyyat və dillər kafedrasının müəllimi Vüqar Hüseynov bu kimi tədbirlərin həm gənc nəslin bilik və bacarıqlarının artırılmasındakı əhəmiyyətindən danışmış, həm də Gənclər Fondunun gənclərə dəstək verməklə, onların potensialının üzə çıxarılmasının müsbət əhəmiyyətini qeyd etmişlər.

Layihənin ilk günü gənclər "Fərdi oyun"da qüvvələrini sınamışlar. 40 nəfər tələbə-gəncin iştirak etdiyi yarışda Qeyrət Əmirov qalib gəlib. Aynurə Şıxməmmədova ikinci, Rakim Zeydullazadə isə üçüncü yeri tutublar. Qalib və mükafatçılara diplomlar, medallar, müxtəlif kitablar və kubok təqdim olunub.

**Mətbuat və informasiya şöbəsi**

# ADPU-nun Şəki filialında 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə bədii-əyləncəli bayram tədbiri keçirilib

Dekabr ayının 26-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialının professor-müəllim heyətinin və tələbə kollektivinin iştirakı ilə Şəki şəhərindəki "Çələbi xan" restoranında 31 Dekabr -Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə bədii-əyləncəli bayram tədbiri keçirilib.

Tədbirdə qarşıdakı bayramlarla əlaqədar təbriklər söylənilib, tələbəgənclərin hazırladıqları bədii-əyləncəli və musiqili proqramlar nümayiş etdirilib. Bayram tədbirinin sonunda "İlin ən yaxşı tələbəsi", "İlin ən yaxşı qrupu", "İlin ən yaxşı qrup nümayəndəsi" və s. nominasiyalar üzrə fərqlənənlərə fəxri fərmanlar təqdim olunub.

# 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyası başlayıb

29 dekabr 2015-ci il tarixdən Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında 2015-2016-cı tədris ilinin payız semestrinin imtahan sessiyası başlayıb. Qeyd edək ki, imtahanlara hazırlıq vaxtında və yüksək səviyyədə başa çatdırılıb, imtahan otaqları müəyyənləşdirilib, həmçinin 12 nəfərdən ibarət münaqişə komissiyası və imtahan qərargahı yaradılıb, müvafiq əmrlə imtahan nəzarətçiləri müəyyənləşdirilib.

Bunlarla yanaşı, imtahan və məsləhət saatlarının cədvəlləri vaxtında tərtib olunaraq müvafiq guşədən asılıb, imtahan biletləri tərtib olunaraq təsdiq edilib, imtahan biletlərinə daxil ediləcək suallar bir ay öncə tələbələrə çatdırılıb.

Məlumat üçün qeyd edək ki, imtahan sessiyası I, II, IV kurslarda və "Təhsildə sosial-psixoloji xidmət", "Məktəbəqədər təlim və tərbiyə" ixtisaslarının III kurslarında 29 dekabr 2015-ci il tarixdən 1 fevral 2016-cı ilədək, III kursların digər ixtisaslarında isə 29 dekabr 2015-ci il tarixdən 25 yanvar 2016-cı ilədək davam edəcəkdir.

**Mətbuat və informasiya şöbəsi**

# Seyid Əzim Şirvaninin 180 illik yubileyinə həsr olunmuş tədbir keçirilib

Dekabr ayının 22-də Şamaxı Rayon Mədəniyyət Mərkəzində Azərbaycan xalqının böyük klassik şairi Seyid Əzim Şirvaninin 180 illik yubileyinə həsr olunmuş tədbir keçirilib. Məlumat üçün qeyd edək ki, Şamaxı Rayon İcra Hakimiyyəti, Azərbaycan Dövlət Pedaqoji Unviersitetinin (ADPU) Şamaxı filialı və Şamaxı Rayon Mədəniyyət və Turizim Şöbəsinin birgə keçirdiyi bu tədbirdə rayon ictimaiyyətinin nümayəndələri, ziyalılar iştirak ediblər.





Tədbirdə çıxış edənlər görkəmli şairin həyat və yaradıcılığından, zəngin bədii irsindən danışıblar. Qeyd olunub ki, Öamaxıda ruhani ailəsində dünyaya göz açan S.Ə.Şirvani mədrəsədə oxuyub, orta ruhani təhsili alıb. Şair sonrakı fəaliyyətində Şamaxıda məktəb açıb, şagirdlərə Azərbaycan, fars və rus dillərini tədris edib. S.Ə.Şirvani bu məktəbdə uşaqlara dini elmlərlə yanaşı, tarix, coğrafiya, hesab və digər fənlərdən ilkin biliklər verib. Böyük satirik şair Mirzə Ələkbər Sabir, tanınmış yazıçı və pedaqoq Sultan Məcid Qənizadə də məhz həmin məktəbin yetirmələri olublar.

Tədbirdə həmçinin S.Ə.Şirvaninin Azərbaycan ədəbiyyatına gətirdiyi yeniliklərdən, onun yaradıcılığındakı janr müxtəlifliyindən söz açılıb. Qeyd olunub ki, zəngin ədəbi yaradıcılığa malik olan şairin bədii irsi Azərbaycan və fars dillərində olan iki böyük külliyyatdan ibarətdir. Bu külliyyatın Azərbaycan dilində olan hissəsinin əsasını qəzəl janrında yazdığı şeirləri təşkil edir. Bu qəzəllərdə həyat sevgisi, nikbin əhval-ruhiyyə, dini etiqad xüsusi yer tutur.

Tədbirdə Şamaxı özfəaliyyət kollektivi S.Ə.Şirvaninin qəzəllərini ifa edib. ADPU-nun Şamaxı filialının tələbə-gənclərinin ifasında səsləndirilən qəzəllər alqışlarla qarşılanıb.

**Mətbuat və informasiya şöbəsi**

# Tələbələrin Qış Elm Festivalı

Dekabr ayının 21-də Qafqaz Universiteti rəhbərliyinin dəstəyi, bu universitetin Tələbə Elmi Cəmiyyətinin (TEC) sədri Elvin Qədirlinin fəal iştirakı ilə tələbələrin Qış Elm Festivali keçirilib. Qış Elm Festivalında müxtəlif universitetlərin tələbələri öz ilkin elmi araşdırmalarının nəticələrini təqdim ediblər. Bu festivalda ADPU-nun tələbələri də öz tədqiqatlarının uğurlu nəticələri ilə fərqləniblər.

Qeyd edək ki, bu elmi tədbirdə universitetimizi 2 tələbə təmsil edib. Filologiya fakültəsinin II kursunun 209-cu qrup tələbəsi Ayşən Dünyamalıyeva "Kimyaçı mütəxəssislərin insan kapitalı kimi formalaşmasına ingilis dilinin təsirinə dair araşdirmalar" mövzusunda, Kimya fakültəsinin III kursunun 303-cü qrup tələbəsi İbrahim Şahbazlı isə "Neft-kimya məhsullarına əlavə edilən antimikrob birləşmələrin polifunksiyanallığının təmin edilməsinin məqsədəuyğunluğu" mövzusunda ilkin elmi araşdırmalarının nəticələri əsasında festival iştirakçılarına ətraflı məlumat veriblər.



Tədbirdə Qafqaz Universiteti rəhbərliyinin yaratdığı Münsiflər Heyəti tərəfindən qiymətləndirmə keçirilib. Bu qiymətləndirmə əsasında İbrahim Şahbazlı 2-ci yer layiq görülüb, Ayşən Dünyamalıyeva isə uğurlu iştirakçı sertifikatı ilə təltif olunub.



Qeyd etmək yerinə düşər ki, hər iki tələbə festivalda universitetimizi Kimya fakültəsinin "Yeni bioloji aktiv birləşmələr" Elmi-Tədqiqat Laboratoriyasının müdiri, kimya üzrə fəlsəfə doktoru, dosent Rəhimə Məmmədovanın elmi rəhbərliyi ilə təmsil ediblər.

Festival çox maraqlı təşkil edilib. Sonda Qafqaz Universitetinin rektoru, professor-doktor Ahmet Saniç gənc tədqiqatçılar ilə görüş keçirib. Görüş zamanı ADPU-nun tələbələrinin uğurlu iştirakı xüsusi qeyd edilib.

Biz də tələbə-gənclərimizi bu münasibətlə təbrik edir və onların belə uğurlarının davamlı olmasını arzulayırıq.

# Azərbaycan gəncləri dünyanın 32 ölkəsinin 379 ən nüfuzlu universitetində təhsil alır

"2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı" çərçivəsində son 8 il ərzində 3558 nəfər xaricdə təhsil almaq hüququ qazanıb. Bu il isə Proqram üzrə 373 nəfər xaricdə təhsil almaq hüququ əldə edib. Tələbələr 32 ölkənin 379 ən nüfuzlu universitetində təhsil alırlar. Onlardan 1032 nəfəri Birləşmiş Krallığın, 767 nəfəri Türkiyənin, 441 nəfəri Almaniyanın, 242 nəfəri Kanadanın, 181 nəfəri Niderland Krallığının universitetlərində ixtisaslara yiyələnirlər. Proqram çərçivəsində ali təhsilin prioritet istiqamətləri üzrə 923 nəfər tibb, 847 nəfər iqtisadiyyat, 348 nəfər informasiya texnologiyaları, 337 nəfər mühəndislik, 221 nəfər sosial və humanitar elmlər üzrə təhsil alırlar. Tələbələrin 1044 nəfəri bakalavriat, 1526 nəfəri magistratura, 547 nəfəri rezidentura, 168 nəfəri doktorantura, 213 nəfəri baza ali tibb təhsili səviyyələri üzrə təhsil alırlar. Bugünədək 1000-ə yaxın tələbə artıq məzun olub. Sonuncu Dövlət Proqramı təqaüdçülərinin 2021-ci ildə məzun olması gözlənilir, onlar da tibb təhsili alan gənclərdir. Hazırda məzunların 60 faizi özəl, 40 faizi isə dövlət sektorunda fəaliyyət göstərir.

# ADPU-nun Cəlilabad filialında 31 Dekabr - Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə bayram tədbiri keçirilib

Dekabr ayının 29-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad filialında 31 Dekabr -Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə tədbir keçirilib. Tədbirdə ADPU-nun Cəlilabad filialının rəhbərliyi, əməkdaşları və tələbə heyəti iştirak edib. Tədbir filialın direktoru, dosent Xudayar Sultanlının təbrik nitqi ilə başlayıb. Direktor X.Sultanlı tədbir iştirakçılarını 31 Dekabr -Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü və Yeni il münasibətilə təbrik edib, onlara həyatda və təhsildə uğurlar arzulayıb. Direktor X.Sultanlı ümummilli lider Heydər Əliyevin uzaqgörən siyasətinin bariz nümunəsi olan 31 Dekabr -Dünya Azərbaycanlılarının Həmrəyliyi Gününün təsis edilməsinin tarixi əhəmiyyətini xüsusi vurğulayıb və bu barədə ətraflı məlumat verib.



ADPU-nun Cəlilabad filialının tədris və elmi işlər üzrə direktor müavini E. Məmmədov çıxışında qarşıdan gələn bayramlar münasibəti ilə müəllim və tələbələri təbrik edib, hər iki bayram barədə geniş danışıb.

Daha sonra müəllim və tələbələrin təbrikləri dinlənilib. Tədbir tələbələrin hazırladıqları rəngarəng ədəbi-bədii proqramla davam etdirilib. Klassik Azərbaycan əsərlərindən səhnələr, şeir kompozisiyaları, vətənpərvərlik mövzusunda mahnılar, viktorinalar təqdim edilib.

**Mətbuat və informasiya şöbəsi**

# Ali məktəb tələbələri arasında futzal üzrə yarışlar keçirilib



İlk olaraq onu qeyd edək ki, hazırda ölkəmizdə gənclərin müasir standartlara uyğun təhsil almaları ilə yanaşı, onların asudə vaxtlarını səmərəli keçirmələrinə və fiziki cəhətdən sağlam yetişmələrinə dövlət səviyyəsində böyük qayğı və diqqət göstərilir. Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı (ATİAHİ) bu istiqamətdə məqsədyönlü səmərəli fəaliyyət göstərir. ATİAHİ-nin Respublika Komitəsinin Rəyasət Heyəti tələbə-gənclərin asudə vaxtlarını səmərəli keçirmələri, həmçinin onların idmana olan həvəsini və fiziki hazırlığını artırmaq məqsədilə oktyabr ayının 6-da respublikamızın ali məktəb tələbələri arasında futzal üzrə yarışların keçirilməsi haqqında müvafiq qərar qəbul edib. Həmin qərarda futzal üzrə yarışların I turunun hər bir ali məktəbdə noyabr ayının 1-dən noyabrın 20-dək, II turunun isə dekabr ayının 1-dən dekabrın 10-dək keçirilməsi öz əksini tapıb. Bu məqsədlə ATİAHİ-də tərkibinə təcrübəli və peşəkar şəxslərin daxil olduğu 8 nəfərdən ibarət Təşkilat Komitəsi yaradılıb. Qeyd edək ki, yüksək səviyyədə keçirilən yarışlarda Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) futbol komandası da iştirak edib.

**"Gənc müəllim"**

# MÜƏLLİMLİK PEŞƏSİNİ NECƏ SEVDİM

Mən fizika müəllimliyi peşəsini öz arzumla seçmişəm. Bu yaxınlarda Bakı şəhərinin Yasamal rayonundakı Ş.Əfəndizadə adına 13 nömrəli tam orta məktəbdə pedaqoji təcrübədə olduq. Etiraf edim ki, mənim üçün əvvəlcə şagirdlərlə ünsiyyət qurmaq, sınaq dərsləri aparmaq çətin olsa da, sonradan bu işin öhdəsindən gələcəyimə məndə inam və ümid hissi yarandı. Bu inamı məndə 50 ildən çox pedaqoji sahədə uğurla fəaliyyət göstərən metodistimiz, fəlsəfə doktoru, dosent Fikrət Rəştiyev yaratdı. Mən onun simasında müəllim adının ucalığını bir daha anladım. Başa düşdüm ki, müəllimlik peşəsi bütün peşələrdən şərəfli və üstündür. Axı hər bir peşə sahibinin özünün də müəllimi olub. İndi artıq əminəm ki, bu peşəni ürəkdən sevsəm, öyrənsəm, həyatda uğur qazana bilərəm. Mənim fikrimcə, müəllim təkcə öyrədən yox, həm də tərbiyəçi olmalıdır. Çünki tərbiyə edilənin tərbiyəçiyə bəslədiyi münasibət tərbiyəçinin tərbiyə edilənə münasibətinin güzgüsüdür. Güzgü isə üzərinə düşən şüaları əks etdirir. İnsan ömrü boyu oxuyur, öyrənməyə can atır. Axı həyatın, kainatın insanlararası münasibətlərin bütün sirlərinin açarı elmdədir. Allahın rəsulu Məhəmməd Peyğəmbər (S.) buyurub: "Elm öyrənin, çünki elm sahibini yaxşını pisdən ayırmağa qadir edir və behiştin yolunu hamarlayır". Müəllim həmişə çalışıb ki, bilik əldə etsin və onu şagirdlərinə öyrətsin. Yəni müəllimə xas cəhətlərdən biri də illər boyu əldə etdiyi biliyi başqalarına vermək qabiliyyətidir. Artıq mən əminəm ki, öz istəklərimi öz ürəyimcə yerinə yetirə bilərəm. Çünki mən bu peşəni ürəkdən sevirəm. Əgər hər hansı bir peşəni, sənəti sevirsənsə, onun fədaisi olmağa hazırsansa və ən nəhayət, onun çətinliklərini də, müsbət cəhətlərini də eyni həvəslə qəbul edirsənsə, deməli, bu yol səni uğurlara doğru aparacaq.



**Nigar Hümbətova,**
**Fizika və ümumi texniki fənlər fakültəsinin IV kursunun 402-ci qrup tələbəsi**

# "Peşəkarlar Akademiyası"layihəsinə yekun vurulub

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının Layihələr Departamentinin layihəsi olan "Peşəkarlar Akademiyası"na yekun vurulub. Dördgünlük təlim paketinin son günü və bağlanış mərasimi "Ambassador Hotel"də baş tutub.

Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) qərargahında keçirilən layihənin ilk 3 günündə Məhəmməd Səmədovun təqdimatında "İctimai sfera", "Layihənin yazılması" və "Layihə idarəçiliyi" mövzularında təlimlər keçirilib. Təlimlər paketinin 3-cü gününün digər təlimi isə Nurlana Hafizin təqdimatında "Karyera quruculuğu" mövzusunda keçirilib.

Layihənin 4-cü günü isə Azər İsmayılovun təqdimatında "Mənim PR-ım" mövzusunda təlim keçirilib. Daha sonra layihənin bağlanış mərasimi keçirilib. Layihələr Departamentinin direktoru Nigar Xıdırovanın giriş sözü ilə açdığı tədbir təlimçilər Məhəmməd Səmədovun, Nurlana Hafizin və Azər İsmayılovun, həmçinin TGT-nin sabiq sədri Sahil Qələndərovun və təşkilatın sədr müavini Məhəmməd İsrayılzadənin çıxışları ilə davam edib.

Nigar Xıdırovanın təlim iştirakçılarını sertifikatla təltif etməsindən sonra "Project+" layihəsinin təsisçisi Məhəmməd Səmədovun üçgünlük təlimlərin yekunu olaraq keçirdiyi imtahanın nəticəsində ilk 3 yerin qalibləri sertifikatla mükafatlandırılıblar.

**"GƏNC MÜƏLLİM"**

# Müəllimlik yolunda ilk addımlarım

Hər bir yeni işdə, yaradıcılıqda, sənətdə atılan addımlar məsuliyyətli bir işdir. Mən də həyatımın müəyyən mərhələsində ilk addımlarımı atmışam. Belə addımlarımdan biri də Bakı şəhərinin Yasamal rayonundakı Ş.Əfəndizadə adına 13 nömrəli tam orta məktəbdə pedaqoji təcrübədə atdığım addımlardır.

Hər bir gəncin həyatda çoxlu arzuları olur. Mənim üçün bu arzuların birincisi ali təhsil almaq, müəllim olmaqdır. Müəllimlik peşəsinə maraq məndə uşaq yaşlarımdan oyanmışdır. Sonralar bu maraq qarşısıalınmaz arzuya çevrildi. Elə bu arzu ilə də ADPU-nun Fizika və ümumi texniki fənlər fakültəsinə qəbul oldum.

Müəllimlik çox şərəfli, eyni zamanda şərəfli olduğu qədər də mürəkkəb və məsuliyyətli peşədir. Şagirdlər müəllimin simasında ağıllı, düşüncəli, peşəsinə vurğun bir insanı görməlidirlər. Elə mən də bu düşüncə ilə III kursda pedaqoji təcrübədə olarkən müəllimliyə doğru ilk addımlarımı atdım.

Pedaqoji təcrübədə olduğum zaman müəllimlik peşəsinə marağım, həvəsim daha da artdı. Pedaqoji təcrübədə ilk addımlarımızın uğurlu olması üçün metodistimiz, dosent, fəlsəfə doktoru Fikrət Rəştiyev öz imkanlarını bizdən əsirgəmir, lazımi məsləhətlərini verirdi. Müəllim kimi özümü ilk dəfə 6b sinfində sınadım. Həmin gün çox həyəcanlı idim. Buna baxmayaraq, ilk sınaqdan uğurla çıxdım. İlk dəfə sinfə daxil olarkən mənə elə gəlirdi ki, sanki özgə bir aləmə düşmüşəm Sonra yavaş-yavaş həmin mühitə uyğunlaşdım. Yeni tədris ilinin başlanması ilə IV kursda pedaqoji təcrübədə növbəti addımlarımı atdım.

Bu dəfə hər şey tamam başqa cür idi. Əvvəllər keçirdiyim həyəcan hissi indi inamla, əminliklə əvəz olunmuşdu. Bu dəfə artıq 9, 10 və 11 -ci siniflərdə özümüzü sınadıq. Pedaqoji təcrübədə olduğumuz müddətdə bir neçə dəfə dərs keçdim. Şagirdlərin mənimlə əsl müəllim kimi davranmaları məni çox sevindirdi. Bu isə mənim yaddaşımda daim yaşayacaq və əziz tutulacaqdır.



**Fidan HÜMBƏTOVA,**
**Fizika və ümumi texniki fənlər fakültəsinin IV kursunun 402-ci qrup tələbəsi**

# "Heydər Əliyev kuboku" uğrunda "Nə? Harada? Nə zaman?" intellektual yarışı keçirilib

Dekabr ayının 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) ADPU "İntellektual Oyunlar Klubu"nun təşkilatçılığı və "Hədəf" Şirkətlər Qrupunun dəstəyi ilə ulu öndər Heydər Əliyevin xatirəsinə həsr olunmuş "Heydər Əliyev kuboku" uğrunda "Nə? Harada? Nə zaman?" intellektual yarışı keçirilib. Səsləndirilən suallar ulu öndər Heydər Əliyevin keçdiyi şanlı həyat yolundan, müasir Azərbaycan tarixində oynadığı roldan və xalqımıza verdiyi töhfələrdən bəhs edirdi. Yarış ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyətindən bəhs edən videoslaydın nümayişi ilə başlayıb. Sonra çıxış edən ADPU-nun İOK-nun rəhbəri Ülvi Şamilov yarışın əhəmiyyətindən danışıb və bütün komandalara uğurlar arzulayıb. Qeyd edək ki, yarışda səsləndirilən sualların müəllifi Ülvi Şamilov, ideya müəllifi Mirzə Hacızadə idi. Gərgin mübarizə şəraitində keçən yarışın sonunda "5+1" komandası 16 xal topluyaraq "Heydər Əliyev kuboku"-nun sahibi olub. "Costa-Rica" komandası 15 xal ilə 2-ci yeri, "İstiqlal" komandası 13 xal ilə 3-cü yeri tutublar. Qaliblər kubok, medal və diplomlarla mükafatlandırılıblar.

**Ramid Seyfullayev,**
**Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültəsinin III kurs tələbəsi**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Azərbaycan tarixi kafedrasının dosenti Müzəffər İsayevə qardaşı

**Heydər İsayevin**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Fiziki tərbiyə və çağırışaqədərki hazırlıq və onun tədrisi metodikası kafedrasının müəllimi Məsim Quliyevə anası

**Sehran xanımın**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

| Redaktor: Mənsur İBRAHİMOV | ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41 | Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır | ADPU-nun web-portalı: adpu.edu.az Fotolar Əli Səmədovundur Şəhadətnamə № 191 | Sifariş: 135 Sayı: 1500 Çapa imzalanıb: 30.12.2015-ci il | ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir. |
|---|---|---|---|---|---|